AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
MƏHƏMMƏD FÜZULİ ADINA ƏLYAZMALAR İNSTİTUTU

**HACI HƏSƏN HÜSEYNİ**

# İMAM RZA (Ə) MÜXTƏLİF BAXIŞLARDA

**Bakı-2019**

***Kitab şüarları “La İlahə illəllah” olan 124000 peyğəmbərin pak və müqəddəs ruhlarına ithaf olunur.***

***AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun elmi şurasının 1 saylı, yanvar 2019-cu il tarixli iclasının qərarı ilə çap olunur.***

*Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin DK-657/Ə saylı, 05 iyul 2019-cu il tarixli razılıq məktubu əsaslnda çap olunur.*

Nəşrə hazırlayan
və ön söz müəllifi:
**SONA XƏYAL**

Redaktor:
**Azadə Musabəyli**
filologiya üzrə elmlər doktoru

Rəyçilər:
**Tahirə Həsənzadə**
tarix üzrə elmlər doktoru
**Zəkiyyə Əbilova**
fəlsəfə üzrə elmlər doktoru

**Hacı Həsən Hüseyni. İmam Rza (ə) müxtəlif baxışlarda.** Bakı-“Ecoprint”-2019. 208 səh.

Müəllifin dini tarixi şəxsiyyətlər silsiləsindən olan bu növbəti kitabı səkkizinci imamımıza həsr olunmuşdur. Kitabda Həzrəti-Rzanın (ə) həyat və fəaliyyəti müxtəlif tarixi mənbələrə istinadən araşdırılmışdır.

# ƏHLİ-BEYTƏ (ə) MƏHƏBBƏTLƏ

Allah-təala insanları yaradanda taleyini müəyyən edir, yaşayacağı ömür yolunu, zamanını, məkanını, qabiliyyət və bacarığını, həyatdakı missiyasını bizim “alın yazısı” saydığımız bir ömürnamə kimi yazır. Biz dünyaya gəlirik, yıxıla-dura böyüyürük, hərəmiz bir səmtə üz tututruq. Bəzi insanlar düşünürlər ki, hər şeyi özləri edirlər və ona görə də nəyin bahasına olursa-olsun istədiklərini əldə etməyə çalışırlar. Bəziləri isə Allahın yazısına inanır, hər işdə Allaha təvəkkül edir və başlarını aşağı salıb bacardıqlarını edir, qazandıqları ilə kifayətlənir və Allaha şükr edərək Allahın verdiyi ömrü Rəbbinə layiq yaşamağa səy edirlər. Hacı Həsən də ikincilərdəndir. Hacı Həsəni 20 ilə yaxındır ki, tanıyıram. Sadə, təvazökar, tərbiyəli, saf, bildiyini danışan, bilmədiyini öyrənməyə çalışan bir insandır. Allahın yazdığı taleyə şükr edə-edə az qalıb əllini haqlasın.

Haşiyə: Hacı Həsən Xalıqverdi oğlu Hüseyni 1970-ci il aprelin 25-də Zəngilan rayonunun Sobu kəndində doğulmuşdur. Orta təhsilini orada almışdır. Həsənin gəncliyi ağır illərə düşmüş, vətənpərvərlik, milli təəssübkeşlik bir çox cavanlarımız kimi onu da cəbhə bölgələrinə aparmış, vətənə layiqli övlad kimi öz vəzifə borcunu yerinə yetirən Həsən ağır yaralanmış və İ qrup Qarabağ Müharibəsi əlili kimi uzun müddət yataq xəstəsi olmuşdur. Sonralar özündə ayağa qalxmağa güc tapan Həsən həyata qayıtmış və Bakı İs-

lam Universitetinə daxil olmuşdur. Universiteti müvəffəqiyyətlə bitirən Həsən axund, ilahiyyatçı və şəriət müəllimi ixtisaslarına yiyələnmişdir. Bir din xadimi kimi insanlara xidmət edən Həsən müxtəlif ziyarətlərdə olmuşdur.

Hacı Həsən "Dirili Qurbani Məclisi"nin üzvüdür. O, "Olaylar", "İki sahil", "Nəbz", "Təzadlar", "Hüquq və media", "Uca zirvə", "Əsrin ziyalıları", "Qrabağa aparan yol", "Paklıq" qəzetlərində və "Dirili Aşıq Qurbani", "Dua və ibadət", "Qızıl Zəngilan", "Xəzan" jurnallarında müxtəlif mövzulu geniş həcmli məqalələri ilə çıxış etmişdir. Hal-hazırda "Paklıq" qəzetinin Baş redaktor müavinidir.

"Qızıl Qələm", "Xalqın nüfuzlu ziyalısı" və "Azərbaycan bayrağı mükafatı" və "Xətai" Ali Media mükafati" diplomları ilə təltif edilmiş Hacı Həsən Hüseyni 10-a yaxın kitabın müəllifidir. Bütün kitablarını avtoqrafı ilə mənə hədiyyə etmişdir. Deyirlər, əqidə qohumluğu qan qohumluğundan üstündür. Bu mənada Hacı Həsən mənə doğma qardaşdan da yaxındır.

Hacı Həsənin kitablarında Allah kəlamları, Peyğəmbər hədisləri, imamların və imamzadələrin həyat yolu, yaşam tərzi, dünyaya gəlişləri, faciəli şəhadətləri və s. həm fəxrli, həm də hüznlü ifadələrlə əks olunmuşdur. "Parlaq ulduz" adlı ilk əsəri 2003-cü ildə "Səda" nəşriyyatında çap olunub. Kitab hər iki dünya xanımı Fatimeyi-Zəhra (s.ə.) anamıza ithaf olunub.

Uşaqlıqdan Həzrət Əli əleyhissəlamı çox sevmişəm. Bəlkə də Allahı, Peyğəmbəri anlamadığım vaxtda, yəni 9-10 yaşlarımda. Rəhmətlik anam ilə kəndimizdə məhərrəmilik zamanı keçirilən əza məclislərinə gedərdim (evimiz-

də də hər il 10 gün təziyə saxlardıq). Ayrıca bir dəftərim var idi, Həzrət Əli (ə) haqqında eşitdiklərimi ora qeyd edərdim. Sovet dönəmində imamlar haqqında söhbətləri yalnız belə məclislərdə və ya evdə eşitmək olardı. Dövr dəyişəndən sonra məqalələr yazıldı, dini qəzetlər çap olundu, kitablar yazıldı. Həzrəti-Əli (ə) haqqında yazılan hər məqaləni və hər kitabı böyük hörmət və məhəbbətlə mütaliə edirəm. Əlidən (ə) yazan adamlara xüsusi hörmətim var. Elə Hacı Həsən də ilk görüşdən nəzər-diqqətimi ona görə çəkmişdi. İlk kitabı çap olunanda bütün yaxınları kimi mən də çox sevinmişdim.

Hacı Həsənın "Parlaq ulduz" kitabında "Qədiri-Xum" hadisəsi əhatəli şəkildə işıqlandırılmış, tarixi bayramın mahiyyəti, əhəmiyyəti müxtəlif tarixi mənbələrə istinad edilməklə aydınlaşdırılmış, Quran ayələrinə və hədislərə müraciət edən müəllif fikirlərini sadə şəkildə oxuculara çatdırmağa çalışmışdır. Kitabın ikinci hissəsində bir sıra şairlərin Həzrəti-Əli (ə) və "Qədiri-Xum" bayramı haqqında yazdıqları şeirləri verilmişdir. Kitaba Əlibala Hacızadə və Şahin Fazil rəy yazmışlar.

Hacı Həsənin ikinci kitabı "Xuda Hüseynin Aşiqi" adlanır. 2007-ci ildə "Nurlar" nəşriyyatında çap olunmuşdur. Kitabın redaktoru f.ü.f.d. Vərağa Almasov, ön söz müəllifi Axund Hacı Soltan Əlizadədir. Kitab 10 bölümdən ibarətdir. Müəllif kitabda İmam Hüseynin (ə) mövludundan şəhadətinə qədər baş verən hadisələri işıqlandırmış, Kərbəla faciəsinin səbəblərini və mahiyyətini açıqlamağa çalışmış, bütün bunların klassik şeirimizdə və aşıq ədəbiyyatımızda obrazlarla əksini tədqiqata cəlb etmişdir.

Kitabın redaktoru f.ü.f.d. Vərağa Almasov yazır: "Hacı Həsən əvvəlki kitablarında olduğu kimi bu kitaba da müxtəlif şairlərin Kərbəla faciəsini əks etdirən mərsiyə və sinəzənlərini daxil etmişdir. Son bölümdə Hürr ilə bağlı əhvalatlar, Şah Xətainin Hürrün qəbrini açması, sonrakı peşimançılığı və s. motivlər işıqlandırılmışdır.

Hacı Soltan kitabın ön sözündə yazır: "Hacı Həsənin "Dirili Qurbani Məclisi"nin sədri Yusif Dirili (Mahmudov) ilə birlikdə tərtib etdikləri "Ya Əli" adlı kitabçada bir sıra klassik şairlərin və "Qurbani Məclisi"nin bəzi üzvlərinin Qurbaninin "Əli" və "Ya Mürtəza Əli" rədifli şeirlərinə yazdıqları nəzirələr toplanmışdır. Kitab 2007-ci ildə "Təfəkkür" nəşriyyatında dərc edilmişdir. Kitabın ideya müəllifi və redaktoru Yusif Dirili, ön sözün və izahlı lüğətin müəllifi Həsən Sobulu (Hacı Həsən), rəyçi Hacı Soltan Əlizadə, bədii redaktor Nəriman Mahmuddur. Hacı Həsənin kitaba yazdığı "Həzrət Əlinin (ə) fəzilətləri el sənətkarlarının sazında və sözündə" adlı ön sözü maraq doğurur.

Növbəti kitab Hacı Həsənin toplayıb tərtib etdiyi və 2008-ci ildə "Nurlar" nəşriyyatında dərc edilmiş "Gizli qalmış xəzinə" adlı dini şeirlər toplusudur. Burada Nizami Gəncəvidən tutmuş müasir şairlərimizə qədər bir çox görkəmli söz adamlarının Məhəmməd peyğəmbər (s) haqqında çox dəyərli şeirləri toplanmışdır. Kitab 14 məsuma ithaf olunmuşdur. Kitabın redaktoru f.ü.f.d. Vərağa Almasovdur. O, kitaba yazdığı "Peyğəmbər soraqlı poeziya" adlı ön sözü belə ümidlə bitirir: "Biz İslam dini və onun əzəmətli peyğəmbəri Həzrəti-Mühəmmədlə (s) bağlı bütün mövzularda yazıb-yaradan çağdaş şairlərimizə də, tədqiqatçı Həsən Hü-

seynova da gələcək fəaliyyətində uğurlar arzulayır, ədəbi-bədii və elmi nailiyyətlər qazanacağına ürəkdən inanırıq”.

Şeirlər 10 fəsildə qruplaşdırılmışdır: “Peyğəmbərin (s) mövludu”, “Peyğəmbərin (s) məb’əsi”, “Peyğəmbərin (s) meracı”, “Peyğəmbərin (s) şahlara göndərdiyi məktublar”, “Peyğəmbərin (s) Məkkədən Mədinəyə hicrəti”, “Peyğəmbər (s) zamanında baş vermiş döyüşlər”, “Peyğəmbərin (s) vida həcci”, “Qədiri-Xum hadisəsi”, “Peyğəmbərin (s) vəfatı”, “Peyğəmbərin (s) fəzilətləri haqqında yazılmış şeirlər”.

Hacı Həsən 2011-ci ildə “Nərgiz” nəşriyyatında işıq üzü görmüş “Həzrəti-Əli (ə) müxtəlif baxışlarda” adlı kitabını Xədiceyi-kübranın (ə) və onun simasında Əhli-beyt (ə) yolunda xidməti olan xanımların pak və müqəddəs ruhlarına ithaf etmişdir. Kitabın redaktoru Şəlalə Ana, ön söz müəllifi Dahi Almaslıdır. Əsər haqqında dəyərli fikirlərini oxucularla bölüşən D.Almaslı sözünü belə yekunlaşdırır: “Şair təbiətli bir şəxs kimi tanıdığımız və sevdiyimiz Hacı Həsən Hüseynov yenə də özünə sadiq qalmış, əsərdə orta əsrlər və çağdaş Azərbaycan şairlərinin, ustad aşıqlarımızın bir sıra bədii yaradıcılıq nümunələrindən istifadə etmişdir. Qədiri-Xum hadisəsinə və Həzrəti-Əlinin (ə) ruhi-mənəvi ucalığına həsr olunmuş belə ədəbi-bədii nümunələr, kitabı daha şirin və oxunaqlı etməklə, xalqımızın könlündəki ölməz Əhli-beyt (ə) məhəbbətini bir daha üzə çıxarır”.

Kitab giriş və “Həzrəti-Əlinin (ə) həyatı”, “İslamda nübüvvət və imamət”, “İmam Əli Quranda”, “Qədiri-Xum”, “12 imam Tövratda”, “Quranın qardaşı “Nəhcül-bəlağə”, “Əli (ə) şairlərin gözü ilə”, “Həzrəti-Əli (ə) aşıq ədəbiyya-

tında", "El şairləri", "İnsanlığın böyük nümunəsi Həzrəti-Əli (ə)", "Dualar", "Poemalar", "Bəhri-təvillər", "Şeirlər" adlı 14 fəsildən ibarətdir.

Hacı Həsənin "Sığın Haqq dərgahına" adlı növbəti kitabı 2013-cü ildə "Nərgiz" nəşriyyatında çap olunmuşdur. Kitab İmam Həsənin oğlu Həzrəti-Qasimin və İmam Hüseynin qızı Həzrəti-Rüqəyyənin pak və müqəddəs ruhlarına ithaf olunmuşdur. Kitabın redaktoru Rövşən Fətişoğlu, ön söz müəllifi Leyla Musəvidir.

R.Fətişoğlu yazır: "Müəllif İslam dininin prinsip və müddəalarının izahında mənbələrə istinadən fikir söyləyir. Quran ayələri, İslan peyğəmbərinin (s) sünnəsi, Əhli-beytin (ə) irsi və digər islami dəyərlər poetik dil və onun nümunələri əsasında izah edilir. Kitabdakı məqalələri oxuyarkən, onun müəllifi Seyyid Hacı Həsən Hüseynovun təhlil qabiliyyəti, dini və dünyəvi elmlərə münasibəti yəqinliklə aydın olur. Müəllifin əsəri yazmaqda məqsədi dinimizin reallıqlarını, tarixi gerçəkliyin dini mənzərəsini, dini-ideoloji çalarlarını oxuculara açıb göstərməkdir. Demək olar ki, müəllif bu məqsədinə layiqincə nail olmuşdur. İnanırıq ki, müəllif bu sahədə axtarışlarını davam etdirəcək və gələcəkdə daha samballı araşdırmaların ərsəyə gəlməsinə nail olacaqdır".

Kitab giriş və 8 bölümdən ibarətdir. Birinci bölümdə Quran, şəriət məsələləri, övliyalarla bağlı, ikinci bölümdə 14 məsuma həsr olunmuş, üçüncü bölümdə Allah yanındakı məqam, Həzrəti-Əbülfəzl, Həzrəti-Zeynəb və s. haqqında, dördüncü bölümdə namaz və oruclardan bəhs edən, beşinci bölümdə dini bayramlardan danışan, altıncı bölümdə

"İslamda ailəyə münasibət"i açıqlayan, yeddinci bölümdə cənazə, ehsan, ölüləri ziyarət məsələləri ilə əlaqədar məqalələr verilmişdir. Səkkizinci bölüm "S.M.Şəhriyar dünyasına səyahət" adlanır. Sonda "Uğurlu sonluq" adlı son söz müəllifsizdir. Bəlkə də ön sözün ardıdır...

K.Marksın mənim ən çox sevdiyim və tez-tez işlətdiyim bir hikmətli sözü var: "Təkcə özünü düşünən insan məşhur şair, həkim, müəllim, hətta alim də ola bilər, amma heç vaxt əsl kamil insan ola bilməz". Son söz müəllifi də buna istinadən fikrini belə yekunlaşdırır: "Əgər insan təkcə özü üçün çalışırsa, bəlkə, o, məşhur alim, böyük mütəfəkkir, çox yaxşı şair ola bilər, lakin heç vaxt əsl mənada kamil və böyük insan ola bilməz. Tarix o insanları böyük hesab edir ki, onlar ümumi məqsəd üçün çalışmaqla özləri də nəcibləşirlər: "Kim ki, daha çox başqalarının səadətinə səbəb olur, həyat onu ən xoşbəxt insan kimi yüksəldir". Bu, inkaredilməz bir həqiqətdir. Hacı Həsənin "Sığın Haqq dərgahına" kitabı bu məziyyətlərin real, məntiqi tədqiqi kimi olduqca dolğun, məzmunlu və təsirli hikmətlər boğçasıdır. Bu boğçada müəllif dünya müdriklərinin öz əbədi zövqünə uyğun kəlam və hikmətlərini səbrlə toplayıb oxuculara təqdim etmişdir. Bu özü ən böyük fədakarlıq və xeyirxahlıqdır. Çünki bütün süfrələrdən ən dəyərlisi kəlam və hikmət süfrəsidir. 460 səhifəlik bu "süfrə"dən mən çox şey əxz etdim, amma ondan yenə doymamış ayrılıram". Kitab "Əli eşqi" adlı münacatla bitir.

Hacı Həsənin növbəti dəyərli kitabı 2014-cü ildə "MBM" nəşriyyatında çap olunmuş "Bismilləh" ayəsinin incə görüntüləri və "bə" hərfinin altında olan nöqtənin sir-

ri" imam Hüseynə (ə) və Həzrəti-Əbülfəz Əbbasa (ə) ithaf olunmuşdur.

Kitabın redaktoru Rövşən Fətişoğlu kitaba yazdığı rəyi belə başlayır: "İslamşünas alim Hacı Həsən Hüseyninin geniş oxucu auditoriyasına təqdim etdiyi "Bismilləh" ayəsinin incə görüntüləri və "bə" hərfinin altında olan nöqtənin sirri" əsəri onun bu vaxta qədər çap etdirdiyi kitablar içərisində xüsusi yer tutur. Müəllif bu sanballı əsərində həllini verməyə çalışdığı mövzunu bir neçə sahələr – hədis, təfsir, təcvid, kəlam, xəttatlıq nöqteyi-nəzərindən tədqiqata cəlb etmiş, istifadə etdiyi ədəbiyyat və müxtəlif sənədlər əsasında öz məqsədinə nail olmuşdur.

Müəllif araşdığıcı kimi erudisiyalıdır, yaradıcılıq təcrübəsinə malikdir. Yazıdan-yazıya qələmini püxtələşdirmiş, mühüm dini-fəlsəfi, irfani və digər səpkidə olan hədisləri araşdıran zaman onların sadəcə təsvirini verməmiş, həmin hadisələri istər dil, istərsə də tarixilik baxımından ciddi şəkildə izah etmiş, nəticələr üzərində müfəssəl dayanmışdır.

Kitabda istifadə olunan klassik və müasir ədəbiyyat əsərin süjet xəttini möhkəmləndirmiş, onun elmi-ədəbi və irfani dəyərini xeyli artırmışdır.

Bu kitabı diqqətlə oxuyan oxucu öz mənəvi ehtiyaclarını ödəməklə yanaşı, biliklərini də əhəmiyyətli dərəcədə artırmış olacaqdır".

Kitab giriş və 9 fəsildən ibarətdir. Hər fəsildə böyük bir problemi ortaya qoyan, mənbələrə istinadən tədqiqat aparan, gərəkli məsələlərin həllində səbrlə, təmkinlə əhatəli açıqlamalar verən, oxucuların başa düşəcəyi tərzdə sadə dillə fikirlərini bildirən Hacı Həsən "bə" hərfinin sirrini

açmağa çalışmış, demək olar ki, məqsədinə nail olmuşdur. Müəllifin aldığı təhsil, çoxlu ədəbiyyat mütaliə etdiyi, ardıcıl tədqiqat apardığı, ümumiyyətlə bu sahədə zəngin təcrübə qazandığı hiss olunur.

Şair Zülfiqar Həbibi "Ön söz"də yazır: "Çox hörmətli dostum və qardaşım olan Hacı Həsən ağa uzun illərdən bəri bu mövzu ətrafında araşdırmalar aparmış və nəticə olaraq geniş auditoriyanın marağına səbəb olan sanballı bir əsər ərsəyə gətirmişdir. Oxucularımıza bəri başdan əsəri sonuna qədər səbrlə oxumağı tövsiyyə edirəm və əminəm ki, müəllifin toxunduğu məsələlər onlar üçün faydalı olacaqdır".

Hacı Həsənin növbəti kitabı "Ariflərin Haqqa qovuşma məqamı (Şəriət, təriqət, mərifət, həqiqət)" adlanır. Kitab 2016-cı ildə "Yeni poliqrafist" MMS"-də dərc olunmuş, Hünkar Hacı Bektaş Vəlinin və yeddi ulu ozanın pak və müqəddəs ruhlarına ithaf edilmişdir. Kitabın redaktoru Rövşən Fətişoğlu, ön söz müəllifi Dilbər Ağayevadır.

Kitab haqqında dəyərli fikirlərini oxucularla bölüşən Rövşən Fətişöğlu yazır: "İrfan və ona həsr olunmuş müxtəlif mövzular istər şərq, istərsə də qərb təsəvvüf ədəbiyyatında istənilən qədərdir. Lakin cəsarətlə demək olar ki, müəllifin müvəffəqiyyətlə ərsəyə gətirdiyi bu kitab həqiqətə çatmaq yolunda mücadilə edən ariflərin yaradıcılığı ilə əlaqədar yazılmış qiymətli əsərlərdən biridir".

"Ariflərin Haqqa qovuşma məqamı" giriş və 8 fəsildən ibarətdir. Əvvəlki kitablarında olduğu kimi burada da müəllif hər fəsildə yaxın mövzulu yazıları qruplaşdırmışdır. Kitabdakı yazılar müxtəlif vaxtlarda yazıldığı üçün bəzi

təkrarlar gözə çarpsa da, bunlar insanı yormur, əksinə fikirlərin daha aydın qavranılması üçün köməkçi rolunu oynayır. Kitabı bir dəfə oxumaqla, anlamaq, dərk etmək çətindir. Bir çox məqamlarda dayanıb düşünmək, bəzən geriyə qayıdıb eyni abzası təkrar oxumaq lazım gəlir. Ümumiyyətlə ürfanla, islam fəlsəfəsilə, sufiliklə bağlı əsərləri başa düşmək üçün bəzi istilahları, ürfani terminlərin izahını bilmək lazım gəlir. Hacı Həsən kitaba daxil etdiyi yazılarında bu cəhəti nəzərə alaraq, oxuculara kömək məqsədilə çox vaxt hədislərdən, tarixi hadisələrdən misallar gətirmiş və bununla da əsərdəki çətin fikirlərin asan qavranılmasına imkan yaratmışdır. Əsər olduqca dəyərli əsərdir. Müəllifə bu sahədəki tədqiqatlarında uğurlar arzulayırıq.

Dilbər Ağayeva "Ön söz"də həm kitab haqqında fikirlərini yazarkən, həm bir tədqiqatçı kimi, həm də bir şəxsiyyət kimi Hacı Həsəni də oxuculara təqdim edir: "Həsən həqiqətən ilahiyyatçıdır. Islam ədəbiyyatı və tarixini bir ilahiyyatçı nə qədər bilməlidirsə, bilir. "Ariflərin Haqqa qovuşma məqamı" kitabını oxuyanda və ümumiyyətlə, H.Hüseyninin əsərlərini oxuyanda insanda buna şübhə qalmır, hətta, bəzən bu elə bir sarkazm səviyyəsinə çata bilir ki, istər-istəməz düşünürsən ki, bu, sadə bir ilahiyyatçı səviyyəsi deyildir. Hərdən mənə elə gəlir ki, Həsən ac qala bilər, geyimsiz də dözər, evsiz, məişətsiz də yaşayar, amma kitabsız, elmsiz yaşaya bilməz. H.Hüseyninin elə-belə, söz xatirinə yazılmış bir sətrini belə görə bilməzsən. Fikirləri, diqqətlə düşünülərək bişirilmiş, əsaslandırılmış və çox mötəbər nöqtələrə istinadən ifadə edilmiş olur. Hacı Həsən Hüseyni yaşadığı cəmiyyətin kişisi-

ni qeyrətli, qadınını iffətli, gəncini şücaətli, yeniyetməsini ləyaqətli, dövlətini qüdrətli görmək istəyən humanistlərdəndir”.

Hacı Həsənin hələlik sonuncu kitabı İmam Hüseynin (ə) Kərbəla faciəsindən sonra Şamda şəhid olan qızı haqqında yazılmış “Həzrəti-Rüqəyyə (ə)” adlı əsərdir. Kitab 2018-ci ildə “Ecoprint” nəşriyyatında Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin DK-83/Ə saylı, 6 fevral 2018-ci il tarixli razılıq məktubu əsasında çap olunmuşdur. Kitabın redaktoru Dilbər Ağayeva, ön söz müəllifi Fəxrəddin Meydanlıdır. Müəllif kitabı müqəddəs Kərbəla şəhidlərinə və ata-anasının ruhlarına ithaf etmişdir.

Fəxrəddin Meydanlı kitabın ön sözündə yazır: “Hacı Həsən güclü yaddaşa malik insandır. Onun yaddaşında həm klassiklərimizin, həm də müasir şairlərimizin çoxsaylı şeir nümunələri vardır. Hacı Həsən məclis adamıdır və məclisdəki çıxışlarını bu şeir nümunələri ilə daha da zənginləşdirir. O, sayı 1000 nəfərə çatan mərasim məclislərini özünəməxsus şəkildə elə məharətlə idarə edir ki, hər kəs onun məntiqli, ürfani, Quran nümunələrindən bəhs edən söhbətlərinə, Peyğəmbərdən (s), imamlardan (ə.m.) söylədiyi hədislərə diqqət kəsilir. Bu məclisdən mütləq özü üçün bir ibrət nümunəsi də apara bilir.

Hacı Həsən iç dünyası dolu adamdır. Onu nə qədər çözələsən, nə kələfinin, nə də yumağının ipinin sonu görünməz. O, “Həzrəti-Rüqəyyə (ə)” mövzusunda xeyli vaxt araşdırma aparmış, material toplamış, nəhayət, xanım Rüqəyyəyə (ə) layiq bir əsər ərsəyə gətirmişdir. Fikrimcə,

tədqiqatçı qarşısına qoyduğu məqsədə nail olmuşdur".

Həzrəti-Rüqəyyə (ə) Kərbəla faciəsi ilə əlaqədar olduğu üçün Hacı Həsən əsas mövzuya bir qədər uzaqdan başlamış, demək olar ki, bütünlükdə Kərbəla faciəsinin təsvirini də vermişdir. Rüqəyyə xanımın (ə) həyatına, kəramətlərinə güzgü tutan müəllif onunla bağlı bir sıra hədislərdən, tarixi mənbələrdən istifadə etmişdir.

Həzrəti-Rüqəyyə (ə) faciəsindən bəhs açan Dilbər Ağayeva yazır: "Hacı Həsən bir din xadimi və publisistdir. Qələmini və ruhunu süngü edərək zülmə və cəhalətə qarşı mübarizə aparmaqdadır. Eyni zamanda öz şəxsi nümunəsində cəmiyyətə daha bir mesaj göndərir: hər kəs olduğu yerdə mübarizə apararsa, cəmiyyət qarşısında borcunu yerinə yetirərsə, pisliklər azalar, dünya gözəlləşər, zülm yox olar. Hacı Həsən bütün varlığı ilə dünyaya bu mesajı hayqırır. Buna görə də Rüqəyyə (ə) onun ruhuna bu qədər yaxın və əzizdir".

Kitaba Həzrəti-Rüqəyyə (ə) ilə əlaqədar mərsiyələr və sinəzənlər də daxil edilmiş, sonda isə Fəxrəddin Meydanlının kitabın mövzusuna uyğun şeiri verilmişdir.

Hacı Həsənin "Ya Zəhra (s.ə), nəzərin ayırma bizdən" adlı növbəti kitabı Əhli-beyt aşiqi Şah İsmayıl Xətainin 530 illik yubileyinə ithaf olunmuşdur. Kitab 2018-ci ildə "Ecoprint" nəşriyyatında Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin DK-636/Ə saylı, 28 iyun 2018-ci il tarixli razılıq məktubu əsasında və AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun elmi şurasının 4 saylı, 20 iyun 2018-ci il tarixli iclasının qərarı ilə çap olunmuşdur.

Kitabı nəşrə hazırlayan və ön söz müəllifi Sona Xəyal, redaktoru f.ü.f.d. Vərağa Almasov, rəyçiləri tar.e.d. Tahirə Həsənzadə və fəl.e.d. Zəkiyyə Əbilovadır. Kitab "Giriş" və iki hissədən, I hissə beş bölümdən, II hissə altı bölümdən ibarətdir. Kitab haqqında rəyini "Redaktordan" adı altında təqdim edən Vərağa Almasov fikrini belə yekunlaşdırır: "Əziz oxucular, son olaraq sizə tam səmimiyyətlə bu kitabı oxumağı və oxuduqca həm Fatimeyi-Zəhranın (s.ə), həm də bütövlükdə əziz Peyğəmbərin (s) və onun uca Əhli-beytinin (ə) həyat və mübarizəsi, yüksək elmi, mənəvi, əxlaqi fəzilətləri haqda dərindən-dərinə düşünməyi tövsiyə edirəm. Bu, bizə həm o görkəmli şəxsiyyətləri, həm özümüzü, ən əsası da hamımızı yaradan uca Tanrını daha yaxşı tanımağa yardım edəcəkdir. Güman edirəm ki, islamşünas qardaşımız Həsən Hüseyni bu dəyərli və məsuliyyətli yolda yenə də inamla addımlamaqda davam edəcək. Azərbaycan xalqının, xüsusən də, müxtəlif istiqamətlərdən mənəvi və ideoloji hücumlara məruz qalan gənclərimizin ruhi, mənəvi və ictimai-əxlaqi baxımdan düzgün formalaşmasına öz töhfələrini verəcəkdir".

Kitab yenidən redaktə olunaraq, birinci nəşrdə gedən səhvlər və kompüter xətaları aradan qaldırılmış və 2019-cu ildə "Ecoprint nəşriyyatında yenidən çap olunmuşdur.

Hacı Həsənin oxuculara təqdim olunan "Zülmü qoyma yaxına və ya İmam Rza (ə) müxtəlif baxışlarda" adlı yeni kitabı Məşhəd şəhərində milyonların ziyarətgahı olan səkkizinci imamımızdan bəhs edir. Əsərin dili əvvəlki kitablara nisbətən daha sadədir. Kitab İmam Rzanın (ə) həyat və fəaliyyətinə həsr olunsa da, müəllif burada İmamın

(ə) atası, anası, İranın və Azərbaycanın müxtəlif bölgələrində ziyarətgahları olan bacıları haqqında ayrı-ayrılıqda məlumat verilmişdir. Burada Quran və hədislərdə imamətin yeri və rolunu aydın şəkildə oxuculara çatdırmaq istəyən müəllif bir sıra tarixi mənbələrə və dəyərli kitablara müraciət etmişdir. Kitab giriş və altı fəsildən ibarətdir. Hacı Həsən "Müəllifdən" başlığı altında kitabın təsvirini verdiyindən, biz bu barədə geniş bəhs açmadıq. Təkcə onu deyə bilərik ki, Azərbaycanda İmam Rzanın (ə) həyat və fəaliyyəti ilk dəfədir ki, belə geniş şəkildə, əhatəli təqdim olunmuşdur. Hacı Həsən qardaşımıza tutduğu bu gərəkli yolda yeni uğurlar arzulayır, ondan neçə-neçə belə dəyərli kitablar gözləyirik.

***SONA XƏYAL***
*AMEA-nın Məhəmməd Füzuli adına*
*Əlyazmalar İnstitutunun böyük elmi işçisi,*
*Azərbaycan Yazıçılar Birliyinin*
*"İRS" Komissiyasının sədri*

# MÜƏLLİFDƏN

**Bismillahir-Rəhmanir-Rəhim!**
**Ya Allah, Ya Məhəmməd, Ya Əli, səndən mədəd!**

*İsmin ilə başladım, ey arizular məzhəri!*
*Ey olan zati ğəni, ey gənci-dövlət sərvəri!*
*Qibləgahım, olmaram qul Səndən özgə kimsəyə,*
*Tanrısan, ruzi verənsən, yoxdu Səndən digəri!*
***Məhəmməd Füzuli***

Həmdü səna Allaha məxsusdur. Şükürlər olsun, Allah-təala nəsib etdi ki, İmamət səmasının səkkizinci parlaq ulduzu, məsafə cəhətdən bizə daha yaxın olan İmam Rza (ə) barəsində bu tədqiqat əsərini ərsəyə gətirək və Azərbaycan oxucularına təqdim edək. Digər imamlar kimi İmam Rzanın (ə) şəxsiyyətinə hörmət və məhəbbətim sonsuzdur. Lakin yaxın bir dövr üçün belə bir kitab yazmağı planlaşdırmamışdım. İşlərimin çoxluğu və vaxt məhdudiyyəti üzündən hələlik belə bir fikrim yox idi. Fəqət 2018-ci il iyun ayının 20-də Bakının Buzovna qəsəbəsi Ruhulla Axundov adına Mədəniyyət Evində "Ya Zəhra (s.ə) nəzərin ayırma bizdən" kitabımın təqdimatı zamanı, əslən Ağdaş rayonundan olan, hal-hazırda Suraxanı rayon Hövsan qəsəbəsində yaşayan Əşrəfov Şamil Əşrəf oğlu adlı oxucu mənə

yaxınlaşdı. Aramızda səmimi söhbət oldu. Söhbət əsnasında o, İmam Rza (ə) haqqında da belə bir kitabın İmamın (ə) mövluduna (2019-cu il iyul – hicri-Qəməri 1440-cı il, zilqədə ayının 11) qədər yazılmasını təklif etdi.

Hacı Şamil Əşrəf oğlu 2009-cu ildən etibarən hər il Zilqədə ayının 11-də Hövsan qəsəbəsində İmam Rzanın (ə) mövludunu qeyd edir. O bunu bir neçə məkanda (evində, məsciddə və s.) yüksək səviyyədə hazırlayır, çoxlu sayda qonaq dəvət edir və könüllüləri də nəzərə alır. Onların hər birinə tədbirdə ürək sözlərini demək üçün şərait yaradır. Məclisdə çıxış edənlər İmam Rzanın (ə) həyat və fəaliyyətindən söhbət açır, iştirakçıları və bilməyənləri məlumatlandırırlar.

Hacı Şamil onu da qeyd etdi ki, İmam (ə) haqqında məlumatların hamısının yığılıb tədqiq edilməsi vacibdir. Bu, İmam Rzanın (ə) ruhuna böyük ehtiramdır. Onun barəsində pərakəndə fikirlərin, hədislərin araşdırılması və bir kitabda yer alması, həmçinin faktların dəqiqləşdirilməsi, məhz düzgün versiyaların oxuculara çatdırılması Allaha da xoş gedər.

Kitabı yazarkən, mən Hacı Şamilin fikirlərinin həqiqiliyinə bir daha əmin oldum. Elə hədislər var ki, onu İmam Rzanın (ə) adına çıxırlar. Elə hədislər də var ki, İmam Rzaya (ə) aid olduğu halda, başqalarının adına çıxırlar. Bu ziddiyyətin aradan qaldırılmasında bu kitabın gözlənilən nəticəni verəcəyinə ümid edirik.

Hacı Şamil dönə-dönə vurğuladı ki: “Növbəti iyul ayında mən bu kitabı Sizdən gözləyirəm. İstəyirəm əmin olum ki, növbəti mövlud günü həmin kitab əlimin altında ola-

caq. Bu işin öhdəsindən İmam Rzaya (ə) layiq bir şəkildə gələcəyinə şübhə etmirəm”.

Bu gün həmin kitab hazırdır və Allaha şükr edirəm ki, bu işi məhz mənə nəsib etdi. Onun uğurla yazılıb başa çatdırılması üçün mənə inam və qüvvət verdi.

Mənim üçün bu tədqiqat sahəsi yeni deyildir. Ağlımın, düşüncəmin və qəlbimin qərar verdiyi bir işi Allahın izni olduqda başlayıram. Bundan əvvəlki yazılarımda da yadımda olmayan, amma, barəsində ehtiramla yanaşdığım mövzular olmuşdur. Sənətinə və şəxsiyyətinə hörmət etdiyim şəxslərin təklifi də mənim üçün dəyərlidir. Əgər onlar belə bir əsəri məndən gözləyirlərsə, demək bu e’timadın bir səbəbi vardır.

Əziz oxucu, artıq kitabın mövzusu sizə bəllidir. Dini ədəbiyyatsevərlərə bu kitabı ürəklə təqdim edərək bildirmək istəyirəm ki, mən bu mövzunu şövqlə araşdırdım və əldə etdiklərimi cəm halında Sizin diqqətinizə təqdim etdim. Sizin fikir və rəyləriniz mənim üçün çox qiymətlidir. Sizdə mübahisə doğuracaq faktlar olarsa, gələcəkdə onların hamısını nəzərə almağa hazıram.

Kitabda İmam Rzanın (ə) şəcərəsi tam araşdırılaraq faktlar bir daha nəzərdən keçirilmişdir. Hər mövzu ayrıca başlıqla təqdim olunmuşdur. Əsəri imkan daxilində daha anlaşıqlı bir dildə oxucu kütləsinə çatdırmağa səy etdik.

İmam Rzanın (ə) valideynləri barədə yazarkən, Peyğəmbər (s) ailəsinin ehtiramı naminə İmamın atası Museyi-Kazımın (ə) keşməkeşli həyat yoluna çox böyük bir sevgi ilə xüsusi diqqət yetirdik və  anası Tüktəm xanımın barəsində əldə edilən məlumatları da araşdırdıq. İmam Rzanın (ə) sevimli bacısı Xanım Fatimeyi-Məsumənin (s.ə) həyatı, fəa-

liyyəti və Qum şəhərində olan ziyarətgahı barədə də əhatəli danışmağı özümüzə borc bildik.

Kitabın İmam Rza (ə) barəsində olmasına baxmayaraq, İmam Museyi-Kazımın (ə) Azərbaycan ərazisində ziyarətgahları olan və adları hörmətlə anılan qızları Həkimə xanım, Rəhimə xanım, Leyla xanım və Xədicə xanım barədə məlumatları da diqqətlə araşdırmağa çalışdıq.

İstər İmam Museyi-Kazımın (ə), istərsə də oğlu İmam Rzanın (ə) yaşadıqları zaman kəsiyi siyasi təqiblər dövrü olduğu üçün, onların bütün həyat fəaliyyətinin mahiyyətini bu təqiblərdən müdafiə təşkil edir. Allah-təala bu əziz bəndələrinə çox böyük kəramətlər, yüksək əxlaq, ağıl və ilahi elm vermişdir. Allahın lütfü və mərhəməti sayəsində onlar Abbasi rejıminin təqibindən qismən xilas olurdular. Eyni zamanda, onların mərhəmətinə sığınan kəslərin amanda qalması üçün həyatlarını fəda etməkdən belə çəkinmirdilər. İmam Museyi-Kazımın (ə) şiələrə görə zindanı, İmam Rzanın (ə) isə Məmunun təkidi ilə vəliəhdliyi qəbul etməsi bunun bariz nümunəsidir.

Kitabın əvvəlində Quran və Hədislərdə imamətin yeri və rolu barədə yığcam məlumat verilmişdir. Bəllidir ki, Əhli-beyt (ə) və imamətin bütün üzvləri barəsində hədislərdə və digər mənbələrdə kifayət qədər məlumat vardır.

Kitab altı bölümdə təqdim olunub. Birinci fəsil İmam Rzanın (ə) atası İmam Museyi-Kazim (ə), anası Tüktəm xanım və bacıları barədədir. Burada ailənin yaşadığı tarixi şərait, keçdiyi yol işıqlandırılır. Xüsusilə, İmam Rzanın (ə) atası Museyi-Kazımın (ə) həyatına bir qədər geniş yer ayrılmışdır.

İkinci fəsil İmam Rzanın (ə) şəxsiyyəti barədədir. Onun barəsində hədislərdə söylənilənlər və tarixi həqiqətlər toplanmışdır.

Üçüncü fəsil İmam Rzanın (ə) müxtəlif din və məzhəb alimləri ilə elmi mübahisələrindən bəhs edir. Bu fəsildə də olduqca maraqlı, həmçinin tarixi reallığa istinad edən materialların işıqlandırılmasına diqqət verilmişdir.

Bundan sonrakı fəsillərdə müxtəlif mənbələrdə İmam Rza (ə) barədə verilən məlumatlar toplanmış, onun aşıq yaradıcılığında yeri və müxtəlif zamanlarda haqqında yazılmış şeirlər öz əksini tapmışdır.

İmamət və onun ayrı-ayrı üzvlərinin hər birinin mənim qəlbimdə xüsusi yeri vardır. Bir din xadimi kimi Allahın seçdiyi bəndələrin həyat və fəaliyyəti, İslam tarixində xidmətlərinin təbliği mənim borcumdur. Sevə-sevə, böyük bir ehtiramla bu missiyanı həyata keçirməyimlə qürurlanıram. Əgər bu istiqamətdə kiçicik bir xidmətim vardırsa, buna görə Uca Yaradana minnətdaram.

Oxucu qarşısına əlidolu çıxmaq məni bir yazar kimi çox sevindirir. Onların da mənə bəslədiyi etimadı imkan daxilində doğrultmağa səy edirəm.

Bu kitabı da İmam Rzanı (ə) sevənlərin ixtiyarına verirəm. Əlhəmdulillahil-Rəbbil-aləmin! Birəhmətikə ya ərhəmər-rahimin (Aləmlərin Rəbbi olan Allaha həmd olsun. Ey mərhəmətlilərin ən mərhəmətlisi olan Uca Tanrı!)

# İMAMƏT QURAN VƏ HƏDİSLƏRDƏ

***Bismillahir-Rəhmanir-Rəhim!***

يَٰٓأَيُّهَا الَّذِينَ آمَنُواْ أَطِيعُواْ اللّهَ وَأَطِيعُواْ الرَّسُولَ وَأُوْلِي الأَمْرِ مِنكُمْ

“Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!”[1]

Peyğəmbərin (s) xüsusi səhabələrindən olan Cabir İbn-Əbdullah Ənsariyə aid edilən bir rəvayətdə belə qeyd edilmişdir: “Bu ayə nazil olduqda, Peyğəmbərdən (s) soruşdum: “Ey Allahın rəsulu (s), Allah və Peyğəmbərini tanıdıq, bəs əmr sahibləri kimlərdir ki, Allah onlara itaəti öz itaəti ilə yanaşı qeyd etmişdir?”. Peyğəmbər (s) buyurdu: “Ey Cabir, onlar mənim canişinlərim və məndən sonra müsəlmanların rəhbərləridirlər. Onların birincisi Əli ibn Əbu Talib (ə), sonra Həsən (ə), sonra Hüseyn (ə), sonra Əli ibn Hüseyn (ə), sonra Tövratda Baqir adı ilə qeyd edilmiş Məhəmməd ibn Əlidir (ə). Cabir, sən onu tezliklə görəcəksən. Onunla görüşəndə salamımı ona çatdırarsan. Ondan sonra Sadiq Cəfər ibn Mühəmməd (ə), Əli ibn Mühəmməd (ə), sonra Həsən ibn Əlidir (ə). Sonra Həsən ibn Əlinin oğlu Məhəmməd, mənim adaşım, həmkünyəm, Allahın yer üzündəki dəlili və Allahın bəndələri arasında qo-

[1] “Nisa” surəsi, ayə 59

ruduğudur. O, elə bir şəxsdir ki, Allah onun vasitəsilə öz adını bütün dünyaya yayacaq. Bu qeyb şəraiti elə olacaq ki, Allah qəlbini iman ilə yoxlamayıncaya qədər heç kəs onun imamətinin inamında sabitqədəm olmayacaq". Dedim: "Ey Allahın rəsulu (s) o, qeybdə olduğu vaxt şiələr ondan faydalanacaqlarmı?" Buyurdu: "Bəli, and olsun məni peyğəmbər göndərənə, buludlarla örtülməsinə baxmayaraq, insanlar günəş işığından faydalana bildiyi kimi, qeyb dövründə şiələr də onun nurundan nur alacaq, rəhbərliyindən faydalanacaqlar. Cabir, bu, Allahın gizlətdiyi sirlərdən və Allahın gizlətdiyi bilgidir. Buna görə də, onu yalnız layiq olana söylə"[2].

XVIII əsrin mütərəqqi şəxsiyyətlərindən biri və ədəbi fəaliyyəti sırf xalqa bağlı, gözəl təbə malik olan şair M.P.Vaqif bir müstəzadında Peyğəmbərin (s) buyurduğu hədislərə istinad edərək, On iki imama (ə) etiqad göstərməyi və sevməyi nəzmə çəkmişdir ki, burada Əhli-beytə (ə) bağlı olan insanların Qiyamət günündə nicat tapanlardan olduğunu vurğulayır və özünü də onlara bağlı sayır:

*İsna əşərə çakəri kəmtər ola Vaqif,*
*Sərdaridi əla,*
*Xaki-dəri-övladi-peyəmbər ola Vaqif,*
*Neylər dəxi dünya?*
*Ol gündə ki, həngameyi-məhşər ola Vaqif,*
*Tut daməni-mövla!*

---

[2] Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah-üzma Nasir Məkarim Şirazi. Bakı-2017, səh. 87

*Fəryadrəsin Heydəri-Səfdər ola Vaqif,*
*Xovf eyləmə əsla!*
*Sən qərqsən hərçənd ki, dəryayi-vəbalə,*
*Tövhiqi bulansan!*

Göründüyü kimi, yuxarıdakı ayədə Allah-təala insanlara bu əziz bəndələrinə itaət etməyi əmr etmişdir. Burada Allah-təala əvvəlcə Onun özünə, ikinci Peyğəmbərə (s) və üçüncü "əmr sahibləri"nə itaət etməyi buyurub. Ayədə Allah-təala və Peyğəmbər (s) məlumdur. Lakin əmr sahiblərinin kimlər olduğunu izah etmək lazımdır. Böyük təfsir alimləri öz kitablarında "əmr sahibi" ifadəsi barəsində bu cür yazmışlar: "Əmr sahibləri Həzrət Əli (ə) və onun on bir övladıdır". Deməli, bu ayədə Allah-təala on iki imama itaət etməyi vacib bilir. İstedadlı qələm sahibi, şair Mövlanə Məhəmməd Füzuli bir beytdə yazmışdır:

*Tövbə qıldıq, ömrümüzdə bir kəsi mədh etməyək,*
*Bir Əli, bir də onun övladı-pakindən səva.*

Başqa bir yerdə şair yazır:

*Əli və on bir imam oğlunun məhəbbətidir,*
*Nizama salmış ay ilə ili və həftələri.*

Tanınmış sünni alimlərindən biri Əbu Bəkr İbn Mətin İbn Abbasdan nəql edir ki, bu ayə Əlinin (ə) barəsində nazil olmuşdur. Bir sıra mötəbər və tutarlı rəvayətlərdə bu ayənin Həzrət Əliyə (ə) aid olduğunu çatdırır. Böyük təfsir

alimlərindən olan və əhli-sünnə məzhəbinə mənsub olan Hakim Həskani Hənəfi Nişaburi bu ayənin təfsirində hədis nəql edib ki, onların hamısında “ülul-əmrin” Əliyə (ə) aid olduğu göstərilir. Həmçinin, “Şəvahidud-tənzil” əsərində də bu ayənin Əlinin (ə) vilayəti barəsində olduğunu göstərən çoxlu sayda hədislər nəql olunmuşdur.

Hakim Nişaburinin rəvayət etdiyi hədislər:

1. Həzrəti-Əlinin (ə) özündən nəql olunur. Əli (ə) buyurur: “Soruşdum ki, ya Rəsulullah, “ülul-əmr” kimlərdir? Həzrəti-Peyğəmbər (s) buyurdu: “Birincisi sənsən.”

2. Məşhur təfsirçi Mücahiddən nəql edir: Bu ayə o vaxt nazil olub ki, Həzrəti-Peyğəmbər (s) Əlini (ə) öz yerinə canişin təyin edib, özü Təbuk müharibəsinə getdi.

3. Səd ibn Vəqqas nəql edir: “Peyğəmbər (s) Təbuk döyüşünə gedirdi. Əli (ə) əlində silah onun ardınca gəlib dedi: “Ya Rəsulullah, mən heç bir döyüşdə səndən ayrı düşməmişəm. İndi mən Mədinədə qalıram, münafiqlər də şayiə yayacaqlar ki, yanınızda olmağımdan xoşunuz gəlmir”. Səd deyir: “Öz qulağımla eşitdim ki, Rəsulullah (s) buyurdu: “Ey Əli, istəmirsənmi ki, Harun Musa üçün necə idisə, sən də mənim üçün elə olasan?” Yəni, Harun Musanın (s) canişini idi, sən də mənim canişinim olasan? Ya Əli (ə), qayıt, Mədinəni münafiqlərdən qoru. Elə bu vaxt həmin ayə nazil oldu və “ülul-əmrə” itaət vacib edildi.”

Əhli-beyt (ə) şairi M.Füzuli bu ayə və hədisi belə qələmə almışdır:

*Dedi Əhməd: Əli mənlə olub Harunla Musa tək,*
*Şəriklik rəmzi var bunda, kəmali-cahi-izzətdir.*

*“Nübuvvətdə Əlinin dəxli yoxdur” ey deyən insan,*
*Nübuvvət əmrinə şirkət deyil bu, hifzi-ümmətdir.*

*Deyillər, dari-dünyadan gedən vəxtində Peyğəmbər,*
*Əlini, söyləmişdir, hifz qılmaq eyni-şükrətdir.*

*Bir ali-firqədir, məhşər olunca, nəsli-peyğəmbər,*
*Bəqayi-dinə baisdir, həm onlar kani-himmətdir.*

*Kimi görsəm, peyğəmbər nəslidir, ali-Əlidəndir,*
*İki ali məqamın nəsli-paki çün ki, şirkətdir.*

Həmin ayədə ən mühüm nöqtə budur ki, Allah-təala əmr sahiblərinə itaət edilməsini özünə və Rəsuluna itaət edilməsi ilə yanaşı əmr edir.

Əbu Bəsir İmam Sadiqdən (ə) soruşur: “Yəbnə Rəsulullah (s), camaat bizə deyir ki, nə üçün Allah-təala Qurani-Kərimdə Əli (ə) və onun Əhli-beytinin (ə) adlarını çəkməmişdir?”

İmam Sadiq (ə) buyurdu: “Onlara belə cavab verin ki, Rəsuli-Əkrəmə (s) namaz hökmü nazil oldu, amma Allah-təala onun üç və ya dörd rükət olmasını bəyan etmədi. Həzrəti-Peyğəmbər (s) də özü camaat üçün rükətlərin sayını bəyan etdi. Həmçinin, zəkatın hökmü ümumi şəkildə nazil oldu, amma onun incəlikləri və hansı halda vacib olması bəyan olunmadı və Peyğəmbər (s) özü şəxsən onları aydınlaşdırdı. Habelə, Allah-təala həccin vacib olmasını əmr etdi, amma neçə dəfə təvaf etməyin vacib olmasını bəyan etmədi və Peyğəmbər (s) bunu da özü camaata bə-

yan etdi. Həmçinin Allah-təala "Allaha, onun Rəsuluna və əmr sahiblərinə itaət edin" ayəsinin nazil etdi, amma əmr sahiblərinin kimlər olduğunu bəyan etmədi və bunun aydınlaşdırılmasını Peyğəmbərin (s) öhdəsinə qoydu. Həzrəti-Peyğəmbər (s) müxtəlif hadisələrlə əlaqədar olaraq əmr sahiblərinin (yəni, özündən sonra ümmətin imamları və özündən sonra haqq canişinlərinin kimlər olduğunu) dəfələrlə bəyan etmiş və İslam ümmətinə çatdırmışdır."[3]

Peyğəmbər (s) buyurub: "Məndən sonra xəlifələr on iki nəfərdir, hamısı da Qureyşdəndir." Həzrəti-Peyğəmbər (s) hər bir münasibətdə əmisioğlu Həzrəti-Əlinin (ə) fəzilətlərini xalqa çatdırıb buyurardı: "Əli (ə) mənim qardaşım, məndən sonra varisim və xəlifəmdir, onu eşidin və ona tabe olun."[4]

Sultan Mahmud Qəznəvinin zamanında İsfahan mahalında bir arif yaşayırmış. Bu arifin mərifəti, imanı, əqidəsi barədə şaha o qədər danışmışdılar ki, şah özü də bu arifi görməyə can atırdı. Bir gün şah öz adamlarına dedi: "Mən İsfahana getmək istəyirəm ki, görüm, onun haqqında deyilənlər düzdür, ya yox?" Şah adamları ilə birlikdə İsfahana gəlir. İsfahana çatanda şah bir qasid göndərərək həmin arifin onun pişvazına çıxmasını istəyir. Şah qasidə deyir: "Get, həmən arifə de ki, şahın mübarək qədəmləri İsfahan torpağına düşüb, yaxşı olar ki, gedib onu siz qarşılayasız. Əgər gəlməsə, ona Quranda olan bu ayəni oxu və məni "əmr sahibi" kimi ona təqdim et. De ki, Allah buyurub:

---

[3] "Üsuli-Kafi", "Kitabul-haccət", səh. 40, hədis-1
[4] "Tarixi-Təbəri" c. 2, səh. 319; "Tarixi ibni-Əsir", cild 2, səh. 65

“İtaət edin Allaha, Onun rəsuluna və əmr sahiblərinə.” Qasid həmin arifin xidmətinə gəlir və şahın əmrini ona çatdırır. Amma arif qasidə məsləhət görür ki, şəhərin nüfuzlu adamları şahı qarşılasın. Vəziyyəti belə görən qasid Qurandan bu ayəni oxuyaraq arifə xatırladır ki, şah da bu ayədə gələn “əmr sahiblərin”dən biridir və sənin də vəzifən əmr sahibinə itaət etməkdir. Arif bu qasidin sözlərini dinlədikdən sonra qasidə arifanə bir cavab verib deyir: Mən oxuduğunuz ayədə “Ətiullah”da (əvvəl Allaha itaət edin) elə qərq olmuşam ki, “Ətiurrəsul”da (Rəsula itaət edin) şərməndəyəm. Əgər Allah və Rəsulunun və əmr sahibləri olan 12 İmamın itaətin yerinə yetirə bilsəm, şahın da xidmətinə yetişərəm.” Qasid heç bir söz deyə bilmir və şahın xidmətinə qayıdır.

“Şura” surəsinin 23-cü ayəsində Allah-təala buyurur: “Allah iman gətirib yaxşı əməllər edən bəndələrinə bununla müjdə verir. (Ya Peyğəmbər!) De: “Mən sizdən bunun (risaləti təbliğ etməyimin) müqabilində qohumluq məhəbbətindən başqa bir şey istəmirəm....”

Qohumlar kimlərdir? Bütün şiə təfsirçiləri və əhli-sünnə təfsirçilərinin bir qrupu “qohumlar” deyilərkən peyğəmbərin (s) (Əhli-beyt (ə) qohumlarının nəzərdə tutduğunu qeyd etmişlər. Bu şərhə qarşı başqa yozum və ehtimallar da irəli sürülmüşdür. Ancaq böyük ehtimalla bu ehtimalları irəli sürənlərin hamısının əsl istəyi imamət və xəlifəlik mövzusunun elə də böyük əhəmiyyət daşımadığını göstərmək, Əhli-beyt (ə) məqamının əhəmiyyətini azaltmaq olmuşdur. Bu ayə ilə bağlı əsl diqqət çəkən məqam ondan ibarətdir ki, bir tərəfdən Allah Quranda peyğəmbərlərin çoxunun dilindən

açıq-aydın şəkildə “biz sizdən heç bir mükafat istəmirik, bizim mükafatımız Allaha məxsusdur” buyurur: (“Şüəra”, 109, 127, 145, 164, 180), digər tərəfdən isə sözü gedən ayədə “mən sizdən qohumlarıma (Əhli-beytimə) sevgidən başqa bir mükafat istəmirəm” buyurur. Daha maraqlı cəhət Allah-təalanın “Fürqan” surəsinin 57-ci ayəsində peyğəmbərə “De: mən peyğəmbərliyimin əvəzində sizdən heç bir mükafat istəmirəm. Təkcə onu istəyirəm ki, insanlar Rəbblərinə tərəf aparan bir yol tutsunlar” deyə göstəriş verir. “Səbə” surəsinin 47-ci ayəsində belə buyurur: “Mənim sizdən istədiyim mükafat yalnız öz xeyrinizədir. Mənim haqqım və mükafatım Allaha aiddir”. Bu dörd ayəni yanaşı qoyduqda belə nəticə almaq olar ki, İslam Peyğəmbəri (s) də digər peyğəmbərlər kimi insanlardan özü üçün heç bir haq və mükafat istəməmişdir. İstədiyi mükafat Əhli-beytinə (ə) qarşı sevgi olmuşdur. Bu isə Allaha aparan yol və insanların öz xeyirlərinə olan bir istəkdir. Çünki, sözü gedən sevgi, imamət, xilafət, peyğəmbərin canişini, Allah rəsulunun ümmət üzərindəki rəhbərliyinin davam etməsi və insanların bu rəhbərlik işığında haqq yola yönəlməsi mövzusuna açılan bir qapıdır. Bu həqiqət peyğəmbərdən (s) nəzər nöqtəsi olan ayənin şərhi ilə bağlı rəvayət edilmiş hadisələrə müraciət etdiyimiz və onları bu ayələrlə yanaşı qoyduğumuz zaman aydın olur. Bu ayənin təfsiri ilə bağlı nəql edilmiş hadisələrin məcmusundan belə nəticəyə gəlirik ki, sözügedən ayə konkret olaraq imamət və rəhbərlik mövzusuna aiddir. Peyğəmbərlik missiyasının haqq və mükafatı məhz, bu məsələyə təyin edilmişdir. Bu haqq insanları Allaha yaxınlaşdırır, faydası onların özlərinə aid olur. İbn Abbas belə nəql

edir: Bu ayə nazil olduqdan sonra səhabələr soruşdu: “Ey Allahın Rəsulu! Bunlar kimdir ki, Allah-təala onları sevməyi bizə əmr edir?”. Buyurdu: “Əli, Fatimə və bu ikisinin övladları”. Habelə peyğəmbər (s) buyurdu: “Allah peyğəmbərləri müxtəlif ağaclardan yaratmışdır. Ancaq mən və Əli bir ağacdan yaradılmışıq. Mən onun kökü, Əli onun budaqları, Həsən və Hüseyn onların meyvələri, şiələrimiz isə yarpaqlarıdır. Onun budağına yapışan xilas olar, ondan uzaq olan süquta uğrayar…”. Sonra peyğəmbər (s) bu ayəni oxudu: “Mən Sizdən peyğəmbərliyimin əvəzində qohumlarıma (Əhli-beytimə) sevgidən başqa bir mükafat istəmirəm”. Əhli-sünnə məzhəbinin böyük təfsirçilərinin qeyd etdiyi başqa bir hədisdə peyğəmbərin (s) belə buyurduğunu görürük: “Məhəmmədin ailəsini sevərək dünyadan köçən şəxs dünyadan şəhid kimi köçmüşdür. Bilin, Məhəmmədin ailəsini sevərək dünyadan köçən şəxs bağışlanmışdır. Bilin, Məhəmmədin ailəsini sevərək dünyadan köçən şəxs dünyadan imanı kamil olan bir mömün olaraq köçmüşdür. Bilin, - Məhəmmədin ailəsini sevərək dünyadan köçən şəxsi ölüm mələyi cənnətlə müjdələyər, sonra Nəkrlə Münkər ona cənnət müjdəsi verər. Bilin, Məhəmmədin ailəsini sevərək dünyadan köçən şəxsi cənnətə elə hörmətlə apar損arlar ki, sanki gəlini bəy evinə aparırlar. Bilin, Məhəmmədin ailəsini sevərək dünyadan köçən şəxsin qəbrindən cənnətə iki qapı açılar. Bilin, Məhəmmədin ailəsini sevərək dünyadan köçən şəxsin qəbrini mələklər rəhmətin endiyi bir məkana çevirərlər… Bilin, Məhəmmədin ailəsi ilə ədavət apararaq dünyadan köçən şəxs Qiyamət günü məhşər səhnəsinə alnında “Allahın rəhmətindən məyus” yazısı yazılmış halda

daxil olar. Bilin, Mühəmmədin ailəsinə qarşı kin-küdurətli olaraq dünyadan köçən şəxs dünyadan kafir olaraq köçər. Bilin, Mühəmmədin ailəsi ilə ədavət apararaq dünyadan köçən şəxs cənnətin ətrini qoxlaya bilməz".

Şanlı kitabımız Qurani-Kərimdə İmamət barəsində olan ayələrdən biri də "Nur" surəsinin 35-ci ayəsidir. Həmin ayənin təfsirində oxuyuruq: "Allah göylərin və yerin nurudur (onları nurlandıran, onların əhalisini doğru yola yönəldən və onların işlərini idarə edəndir). Onun nurunun (din və kitabının) məş'əli, içində çox işıqlı bir çıraq olan çıraqqabı kimidir. Həmin çıraq şüşənin içindədir və o şüşə ulduz kimi parlaq və nurludur. O çıraq (məkan baxımından) nə (günəşin əsr çağı saçdığı) şərqə, nə də (sübh çağı saçdığı) qərbə məxsus olmayan (əksinə günəşin həmişə saçdığı bir məkanda olan) çox bərəkətli bir zeytun ağacından (onun yağı ilə) yanır. Onun yağı hətta ona od toxunmasa belə, (saflıq və şəffaflıqdan) az qalır işıq saçsın. (Yağın, çırağın, şüşənin və çıraqqabının nuru) bir-birinin üstünə yığılmış nurlardır (yəni, Allahın nur olması təsəvvür olunmaz dərəcədə yüksəkdir). Allah istədiyini (xüsusi hidayət ilə) Öz nuruna (dininə) tərəf yönəldir. Allah insanlara misallar çəkir. Allah hər bir şeyi biləndir.

Allah göylərin və yerin nurudur! – Çox gözəl və dərin mənalı bir ifadə! Bu ifadəni dərk etmək üçün iki açıqlamaya ehtiyac var:

a) "Nur" nədir və hansı xüsusiyyətlərə malikdir?

b) Allah bu kəlmədə nəyi və kimləri iradə edir?

"Nur" kəlməsini təfsir alimləri bir neçə mənada açıqlayıblar, o cümlədən:

1.Qurani Kərim - yəni kitab mənasında. “Maidə” surəsinin 15-ci ayəsində buyurulur: “Həqiqətən Allah tərəfindən sizə bir nur və (özü) aydın (olan) və aydınlıq gətirən bir kitab gəlib”.

2. İman - “Bəqərə” surəsinin 257-ci ayəsindıə buyurur: “Allah iman gətirənlərin dostu və başçısıdır. Onları (nadanlıq, küfr və itaətsizliklik) qaranlıqlar(ın)dan (elm, iman və təqva) nur(un)a tərəf çıxarır”.

3. İlahi hidayət - “Ənam” surəsinin 122-ci ayəsində buyurur: “Məgər (küfr və imansızlıq ilə) ölmüş və sonra Bizim (dinə hidayət etməklə) diriltdərək (imanından) onların vasitəsilə insanlar arasında yol getdiyi (yaşadığı) bir nur verdiyimiz şəxs.”

4. İslam ayin və mədəniyyətləri - “Tövbə” surəsinin 32-ci ayəsində buyurur: “Onlar sözləri ilə Allahın nurunu (Onun dinini və kitabını) söndürmək istəyirlər, halbuki Allah kafirlərə xoş gəlməsə belə, yalnız Öz nurunu (hətta zamanın keçməsi, ağılların kamilləşməsi və bütün aləmin islahedicisinin gəlməsi ilə olsa da) kamilləşdirmək istəyir”.

5. Şəxsən Peyğəmbərin (s) özü - “Əhzab” surəsinin 46-cı ayəsində buyurur: “Və həmçinin Allahın (yaradılış) izni (və nəsib etdiyi uğurları) ilə Ona tərəf dəvət edən, aydın və nur saçan bir çıraq (olaraq göndərdik)”.

6. Məsum imam və rəhbərlər - “Camieyi-kəbirə” ziyarətində oxuyuruq: “Allah sizi nurlar şəklində yaratdı ki, Onun ərşinin dövrəsinə toplaşmısınız”.

7. Elm - Məşhur hədisdə buyurulur: “Elm bir nurdur. Allah onu istədiyi şəxsin qəlbində qərar verər”.

Diqqət ediləsi məsələlərdən biri də “nur”un necəliyi və onun hansı xüsusiyyətlərə malik olmasıdır. Bu kəlməni

mənalandırsaq, aşağıdakı nəticə alınar:

1. "Nur" maddi aləmdə ən gözəl və ən lətif şəkildə mövcuddur, demək olar ki, bütün gözəlliklərin qaynağıdır.

2. Bütün alimlərin yekdilliklə qəbul etdiyi budur ki, maddi aləmdə ən yüksək sür'ətə malik olan maddə "nur"dur. Belə ki, o, saniyədə 300 min kilometr məsafəni qət etmək gücünə malikdir. Bu isə, Yer kürəsini 7 dəfə dolanmaq deməkdir. Buna görə də kəhkəşanların və səma cisimlərinin arasında olan məsafə "nur" sürəti (işıq sürəti) ilə ölçülür.

3. Kainatda olan cisimlərin rəng və varlıqları "nur" vasitəsi zahir və müşahidə olunur.

4. Günəşin nuru bizim dünyamızda olan ən mühüm nurlardandır. Təbiətin və bütün canlı mövcudatın həyatda qalmaları məhz bu nura bağlıdır.

5. Bütün aləmdə mövcud olan enerjilər (atom enerjisi istisna olmaqla) Günəşin nurundan qaynaqlanır. Hətta küləyin hərəkəti, yağışın yağması, çayların və şəlalələrin axını, xülasə, biraz diqqət etsək görərik ki, bütün diri varlıqların hərəkət etməsi Günəşin şüasına qayıdır. Günəş nuru vasitəsilə dünyada olan mikroblar və zərərli varlıqlar məhv olurlar. Əgər Günəş nurunu saçmasaydı, Yer kurəsi böyük bir xəstəxanaya çevrilərdi və onun bütün sakinləri ölümlə əlbəyaxada olardı.

Bu iki açıqlamanı nəzərə alsaq görərik ki, Böyük Yaradanın pak zatını anlamaq və anlatmaq istəsək, "nur" kəlməsindən başqa heç bir kəlmə ilə o mənanı ifadə etmək mümkün olmaz (baxmayaraq ki, Allahın pak zatı misal və təşbihdən münəzzəhdir). Məlumdur ki, Allah nurdan da uca bir varlıqdır, sadəcə O vücudda nur da vardır. Demək olar ki, hər kəsin və hər şeyin nuraniyyəti Allaha yaxınlığına bağlı-

dır. Ona daha yaxın olan hər kəs və hər şey daha nuranidir.

Beləliklə, Qurani-kərim nurdur, Onun kitabı olduğuna görə, İslam ayinləri (şəriət və mədəniyyəti) nurdur, çünki Onun yoludur. İlahi Peyğəmbərlər nurdurlar, çünki Onun tərəfindən məbus olublar. Məsum İmamlar nurdurlar, çünki Onun dininin qoruyucusudurlar. İman nurdur, çünki Ona bağlanmanın rəmzidir. Elm nurdur, çünki Onun aşkar olunmağına səbəb olur. Nəhayət, Allah Göylərin və Yerin nurudur…

Şeyx Səduqun "Tövhid" kitabında nəql olunur ki, İmam Rzadan (ə) bu ayənin təfsiri haqqında soruşanda, o Həzrət (ə) buyurdu: "O, göylərin və yer əhlinin hidayət edənidir."

Həqiqətdə hidayət etmək İlahi nurun xüsusiyyətlərindəndir və bu ayənin təfsirində və nur kəlməsinin izahında neçə bənzətmə və izah təfsirçilər tərəfindən deyilmişdir ki, onların hamısı da doğrudur.

"Cövşəni-kəbir" duasının 47-ci (və ya 46) bəndində buyurulur: 1.Ey nurun nuru; 2. Ey nuru nurlandıran; 3. Ey nuru xəlq edən; 4. Ey nuru tədbirli edən; 5. Ey nuru müqəddər edən; 6. Ey hər bir nurun nuru; 7. Ey hər bir nurdan öncə olan nur; 8. Ey hər bir nurdan sonra qalan nur; 9. Ey hər bir nurun fövqündə olan nur; 10. Ey misli-bərabəri olmayan nur!

Səlman Farsi Peyğəmbər ailəsinin üzvlərindən və vəhy evinin yetirmələrindən sayılmışdır. O daim Həzrəti-Peyğəmbər (s), Həzrəti-Əli (ə), hətta Həzrəti-Fatimədən (s) mənən qidalanmışdır. Səlmanın Həzrəti-Fatimədən (s) əxz etdiyi biliklərdən biri də "Nur" duasıdır. Xanım Fatimə (s) atasından öyrəndiyi bu duanı hər sübh və axşam oxuyardı. O bu duanı Səlmana da öyrətdi. Səlman deyir: "And olsun Allaha, mən bu duanı Məkkə və Mədinənin mindən çox

qızdırmaya tutulmuş xəstəsi üçün oxudum və onların hamısı şəfa tapdı".

"Rəhman və Rəhim Allahın adı ilə.

1. Nur olan Allahın adı ilə. 2. Nurun nuru olan Allahın adı ilə. 3. Nur üzərində nur olan Allahın adı ilə. 4. Bütün işləri idarə edən Allahın adı ilə. 5. Nurdan nur yaradan Allahın adı ilə. 6. Nurdan nur yaradan, 7. Tur dağının üzərində Müqəddəs Kitabda (Tövratda). 8. Açılmış vərəqədə yazılan kimi, öz ölçü və miqdarında bilikli Peyğəmbərə (Həzrət Musaya (ə)) nuru (vəhyi) endirən Allaha həmd olsun. 9. İzzəti ilə xatırlanan, fəxrlə tanınan. 10. Həm xoşluqla (möminlər tərəfindən), 11. Həm də ikrahla (kafirlər tərəfindən) şükr olunan Allaha həmd olsun. 12. Ağamız Mühəmmədə və pak nəslinə Allahın salavatı olsun".

Onun nurunun (din və kitabının) məş'əli, içində çox işıqlı bir çıraq olan çıraqqabı kimidir. Həmin çıraq şüşənin içindədir və o şüşə ulduz kimi parlaq və nurludur. ("Nur" surəsi, ayə 35)təkrardır!!!) Ayənin bu hissəsinin haqqında da təfsir alimləri çox əhatəli fikirlər söyləyiblər. Lakin biz vaxta qənaət etmək üçün onların bir neçəsinə işarə etməklə kifayətlənirik:

1."Rozeyi-kafi" (cild 8, səh. 379) kitabında İmam Sadiqdan (ə) belə bir hədis nəql olunur: "Mişkat – Peyğəmbərin (s) mübarək qəlbidir, misbah – elm və hidayət nurudur, Zucacə – Həzrəti-Əlinin (ə) mübarək qəlbidir ki, Peyğəmbərin (s) rehlətindən sonra misbah o qəlbdə qərar tapdı".

2. Şeyx Səduqun "Tövhid" kitabında Həzrəti-İmam Baqirdən (ə) nəql olunur: "Mişkat – Peyğəmbərin (s) mübarək sinəsində qərar tapan elm nurudur. Zücacə – Həzrəti-Əlinin (ə) sinəsidir. "Nurun əla nur" Ali Muhəmmədin (s)

nəslindən bir-birindən sonra gələn məsum imamlardır ki, Allah onları elm və hikmət nuru ilə qüvvətləndirmişdir. Bu mübarək zümrə Həzrəti-Adəmin (ə) zamanından başlayaraq davam edir. Bunlar Allahın Yer üzünə qərar verdiyi xəlifələr və öz bəndələrinə höccətləridir. Heç bir zaman Yer üzü bunlardan xali olmayacaq".

3. Şeyx Səduqun "Tövhid" kitabında (səh. 152) nəql olunur: "İmam Cəfəri-Sadiqdən (ə) bu ayə haqqında soruşdular: "Allah göylərin və yerin nurudur (onları nurlandıran, onların əhalisini doğru yola yönəldən və onların işlərini idarə edəndir). Onun nurunun (din və kitabının) məşəli içində çox işıqlı bir çıraq olan çıraqqabı kimidir." O Həzrət (ə) cavabında buyurdu: "Bu misal Allah-təalanın biz Əhli-Beytin (ə) haqqında buyurduğu misaldır. Peyğəmbər və imamlar Allahın dəlil və nişanələridirlər ki, camaat onların vasitəsi ilə tovhidə, İslam şəriətinə və onun sünnə və vacibatlarına yönəlirlər".

4. "Nuri-səqəleyn" kitabında (cild 3, səh. 602-603) İmam Sadiqdən (ə) nəql olunur ki, Mişkat Fatimeyi-Zəhradır (ə), Misbah Həsən (ə), Zücacə isə Hüseyndir (ə).

Əlbəttə, əvvəldə qeyd etdiyimiz kimi, yuxarıdakı ayənin çox geniş mənası vardır və təfsir olunan mənaların hamısı onun aşkar bir hissəsidir. Bunları nəzərə alsaq, ayənin müxtəlif izahlarının arasında heç bir ziddiyyət yoxdur.

Əgər Nur surəsinin 35-ci ayəsini yazıb yuyub onun suyunu gözünüzə sürtsəniz, qaranlıq və zəifliyi aradan gedər". Bu ayənin fəziləti klassik ədəbiyyat və aşıq ədəbiyyatı nümunələrində əks olunmuşdur. Belə ki, XIX əsrdə yaşamış Nəsrəddin Şah Qacar Həzrəti-Əlinin (ə) şəninə gözəl bir qəsidə yazmış və həmin qəsidədə Mövla Əliyə

(ə) olan sonsuz məhəbbətini büruzə vermişdir. Qəsidə başdan-başa sufilik və hürufilik çalarları ilə zəngindir:

*Xaliqi-yektaya bir məxluqi-yektadır Əli,*
*La ila-illahidə təkrar olan "La"dır Əli!*

Kəlmeyi-tövhiddəki "La" ifadəsi təkrar olaraq "illa"da gəlir və ("başqa", "digər", "özgə" mənasını verir). Beytdən çıxan məna belədir ki, Allahdan başqa məbud yoxdur. Əgər olsaydı o məbud Həzrəti-Əli (ə) olardı.

*Nur əndər nur olmuş, həm zücac əndər zücac.*
*Şişə əndər, şişədə bir nuri-beyzadır Əli.*

Bu beyt "Nur" surəsinin 35-ci ayəsinə istinadən söylənilmişdir. Ayədə buyrulur: "Allah səmaların və yerin nurudur. Onun nuru, içində çıraq olan taxça misalındadır; çıraq isə qəndilin (zücac) içindədir. O qəndil isə sanki parlaq bir ulduzdur". Nəsrəddin şah Qacar bu beytdə bildirir ki, ayədəki nur və qəndildən məqsəd Həzrəti-Əlidir. Doğrudan da bu belədir. Belə ki, "Nisa" surəsinin 174-cü ayəsində gələn "nur" sözü İmam Əliyə (ə) və məsum imamlara aiddir. Ayədə buyrulur: "Ey insanlar, Sizə Rəbbinizdən dəlil gəlmişdir. Biz sizə aydın bir nur nazil etdik".[5]

---

[5] "Qurani-Kərim" Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev. Bakı-2005; Ayətullah Möhsün Qiraəti. "Nur" təfsiri. Bakı 2015 c.VII-VIII. səh. 580-582; Həsən Hüseynov. "Həzrəti-Əli (ə) müxtəlif baxışlarda" Bakı-"Nərgiz"-2011, səh. 263

# I FƏSİL

## İMAM RZANIN (ə) ATASI İMAM MUSEYİ-KAZIM (ə)

Bismillahir-Rəhmanir-Rəhim. Əlhəmdulillahi-Rəbbil-aləmin. Vəs-səlatu vəssəlamu əla Muhəmmədin (s) və alihit-tahirin. Vəl-lənətud-daimətu əla ədaihim əcməin.

*Əliyə bel bağlamışam, ağamdı Museyi-Kazim,*
*Nitqimdə məktəb açılıb, "əlif-bey"nən dastan yazım.*
*Südün gölüdür üzürəm, boş rütbə nəyimə lazım,*
*Güzəranım çox yaxşıdır, bu gözəl dövrana şükür!*
*Dəmirçi Abbas*

Bu fəsli Zəmanə İmamının (əc.f) barəsində İmam Museyi-Kazımın (ə) buyurduğu möhtəşəm bir hədislə başlayırıq. Belə ki, İmam Kazim (ə) buyurub: "Xoş olsun Qaimimizin (əc.f) qeybində ipimizdən yapişan, bizə qarşı dostluq munasibətində (vilayətmizdə) sabitqədəm olan, düşmənlərimizdən uzaq duran şiələrimizin halına! Onlar bizdəndir, biz də onlardanıq"[6].

İmam Museyi-Kazım (ə) Hicrətin 128-ci ilində Məkkə

[6] "Kifayətul-Əsər". səh. 180

və Mədinə arasında olan "Əbva" adlı bir kənddə anadan olmuşdur. İmam Museyi-Kazımın (ə) atası İmam Cəfəri-Sadiq (ə), anası Həmidə (ə) xanım, məşhur ləqəbləri: Əbdi-Saleh, Kazım, Babəl-Həvaic, künyəsi: Əbul-Həsən, Əbu İbrahimdir.

İmam Museyi-Kazımın (ə) yaşadığı dövrü iki mərhələyə bölmüşlər:

1) İmamlıqdan qabaqkı dövr: 128-148-ci illər (20 il).
2) İmamlıq dövrü: 148-183-cü illər (35 il).

İmam Museyi-Kazım (ə) bəni-Abbasi xəlifələrindən dördü ilə eyni dövrdə yaşamışdır: Mənsur Dəvaniqi, Mehdi Abbasi, Hadi Abbasi və Harun ər-Rəşid.

Əvvəldə qeyd etdiyimiz kimi İmam Museyi-Kazım (ə) 128-ci hicri-qəməri ilində Məkkə ilə Mədinə arasında olan Əbva məntəqəsində dünyaya gəlmiş, 183-ci hicri-qəməri ilinin Rəcəb ayının 25-də 55 yaşında Bağdadda şəhid edilmişdir. Müqəddəs məzarı: Bağdadın yaxınlığında, "Kazımeyn" məntəqəsindədir və dünya müsəlmanlarının müqəddəs ziyarətgahıdır. Onu da qeyd edək ki, İmam Museyi-Kazım (ə) "Babul-həvaic"dir, yəni hacətlər qapısıdır[7].

---

[7] Məhəmmədi İştihardi "Könlü oxşayan sözlər". 14 məsumdan hədislər. Mütərcim: Fəxrəddin Altan. Qum, "Ənsaryan" nəşr. 2005. səh. 165

# İMAM MUSEYİ-KAZIMIN (ə) KƏRAMƏTLƏRİ

İmamın (ə) çox sayda kəramətləri olmuşdur ki, onlardan ən məşhur olanlarını bu kitabda təqdim edirik. Əli ibn Yəqtin nəql edir: "Harun bir sehirbazı çağırır ki, onun vasitəsilə İmam Kazımı (ə) məclisdə xəcalətli etsin. Süfrə açılır və həmin sehrbaz çörəyə əfsun oxuyur. İmam Kazım (ə) süfrədə əlini çörəyə atır və çörək göyə qalxır və onu tutmağı bacarmır. Hamı bu səhnəni görüb gülür, Harun xüsusi ləzzət alır. İmam (ə) başını pərdənin üzərində çəkilmiş şir şəklinə çevirir və buyurur: "Ey Allahın şiri! Allahın düşmənini tut!". Həmin şəkil böyüyür və sehrbazı udur. Harunla dostları bu səhnəni görüb özlərindən gedir və ağıllarını itirirlər. Huşu yerinə gələn zaman Harun Həzrətə (ə) deyir: "Sənin üzərində olan haqqıma görə əmr et həmin şəkil udduğu adamı geri qaytarsın". İmam (ə) buyurur: "Əgər Musanın (ə) əsası udduğunu qaytarsaydı, o da həmin kişini qaytarardı".

Zəkəriyya ibn Adəm nəql edir: "İmam Rza (ə) buyurub: "Atam o insanlardan idi ki, beşikdə dil açmışdır".

Yəqub Sərac nəql edir: "İmam Sadiqin (ə) yanına getmişdim, gördüm ki, İmam Kazımın (ə) beşiyinin kənarında dayanıb bir müddət ona öz sirlərini dedi. Mən əyləşib gözlədim və İmam (ə) sirlərini söyləməkdən ayrıldı. Həzrətə (ə) hörmət əlamət olaraq yerimdən qalxdım. Mənə bu-

yurdu: “Mövlanın yanına gəl və ona salam ver”. Mən yaxınlaşıb salam verdim və beşikdə olan körpə mənim salamımın cavabını aydın şəkildə verdi. Buyurdu: “Elə indi evinə get və dünən qızına qoyduğun adı dəyişdir, çünki o adı Allah sevmir”. Bəli, mənim qızım var idi və adını Həmira qoymuşdum. İmam Sadiq (ə) buyurdu: “Oğlumun əmrini yerinə yetir ki, nicat ondadır”.

İmam Kazımın (ə) qardaşı Abdullah Əftəh nəql edir: “İmamət mövzusunda İmam Kazımla (ə) mübahisə edirdik. İmam (ə) atəş yandırdı və saatlarla onun ortasında əyləşdi, insanlarla bu halda söhbət etdi. Sonra ayağa qalxdı və mənə buyurdu: “Əgər sən imamsansa, belə et”.

İbrahim ibn Səid nəql edir: “İmam Kazımın (ə) zindandakı hücrəsinə bir neçə vəhşi heyvan saldılar ki, Həzrəti (ə) parçalasın. Bu vəhşi heyvanlar İmamın (ə) yanında müti və itaətkar oldular, Həzrəti (ə) İmam adlandırdılar və Harunun şərindən Allaha pənah apardılar. Bu xəbər Haruna çatan kimi, İmamı (ə) azad etdi. Dedi: “Qorxuram ki, məni, insanları və ətrafımda olanları özünə məftun etsin”. Harun öz hakimiyyəti dövründə hesab edirdi ki, İmam Museyi-Kazım (ə) böyük var-dövlətə sahib olub, öz ətrafına müxalif qüvvələri toplayacaq. Əhalinin böyük hissəsinin öz xüms və zəkatlarını İmama (ə) verdiklərini xəlifə çox yaxşı bilirdi. Bu səbədən, Harun Mədinəyə səfəri zamanı İmam Kazımı (ə) həbs etmək qərarına gəldi. Mədinə valisinə tapşırıldı ki, İmam Bəsrəyə göndərilib, orada həbs olunsun. Bir il Bəsrə zindanında qaldığı müddətdə İmam Kazım (ə) Bəsrə valisini öz əxlaqı və mənəviyyatı ilə o qədər təsirləndirmişdi ki, vali xəlifənin İmamı öldürmək əm-

rinə qarşı çıxdı. Bundan sonra xəlifənin tapşırığı ilə İmam Kazımı (ə) Bağdada aparıb burada həbsdə saxladılar. Zindanın rəisi Bəsrə valisi kimi İmamın mənəviyyatının təsirinə düşərək, xəlifədən o Həzrətin başqa zindana köçürülməsini xahiş etdi. Zindanların dəyişilməsinin səbəbi bundan ibarət idi ki, Harun zindan qarovulçularından İmamı öldürmələrini tələb etdikdə, onların heç biri bu işi görməyə razı olmurdu. Üçüncü zindanın məsulu Sind (lən) İmamı zəhərləməyə razı oldu və hicri 183-cü ildə 55 yaşında İmam Musa ibn Cəfər Kazım (ə) şəhadətə çatdı.

Harun yalançı şahid gətirməklə çalışdı ki, İmamın zindanda öz əcəli ilə öldüyünü isbat etsin və bu hiylə ilə həm özünə bəraət qazandırsın, həm də İmamın tərəfdarlarının üsyanının qarşısını alsın. Lakin onun bu hiyləsi baş tutmadı və nəhayət, Harunun qohumlarından olan Süleymanın cəhdləri nəticəsində Bağdadda üsyan baş verdi ki, bu da İmamın mübarək bədəninin gizlincə dəfn edə bilməmələrinə, eləcə də Harunun özünün də əzadarlara qoşularaq dəfn mərasimində iştirak etmək məcburiyyətində qalmasına səbəb oldu. Nəhayət, xalq İmam Museyi-Kazımı (ə) İraqda Kazimeyndə torpağa tapşırdı və ona matəm saxlayaraq əza tutdu. O Həzrətin məzarı bu gün də müsəlmanların ziyarətgahıdır.

# İMAM MUSEYİ-KAZIM (ə) MƏNBƏLƏRDƏ

İmam Museyi-Kazım (ə) barədə mənbələrdə olduqca çox qiymətli məlumatlar vardır ki, onlardan bəzilərini nəzərinizə çatdırmaq istəyirik. O şəxsin böyüklüyünü fərqli mövqelərdən müəyyən etmək olar ki, oxucular İmam (ə) haqqında daha çox, daha əhatəli məlumat əldə etmiş olsunlar. Biz bunu düşünərək, bir çox mənbələri araşdırdıq, müxtəlif ravilərin söylədikləri hədislərdən faydalanaraq, imkan daxilində ən doğru və düzgün versiyaları kitaba daxil etdik. O Həzrətin (ə) dövründə yaşamış Əhli-beyt (ə) tərəfdarlarının heç biri elm və şücaətdə onunla müqayisə edilə bilməzdi. O Həzrət (ə) elm, təqva, zöhd, ibadət baxımından öz zamanının ən öndə olanı idi. Şeyx Müfid o Həzrət haqqında belə yazır: “Əbülhəsən (İmam Kazım) (ə) öz zamanının ən abidi, ən fəqihi və ən səxavətlisi idi”.[8]

Şeyx Təbərsi yazır: “İmam Kazım (ə) Allahın kitabını qorumaqda ən öndə gedənlərdən idi... Mədinə əhalisi onu “Allaha ibadətdə səy edənlərin zinəti” adlandırmışdı”.[9]

İbn Əbil-Hədid İmam Kazım (ə) haqda belə yazır: “Fəqihlik, dindarlıq, təqva və səbir – bütünlükdə o Həzrətdə toplanmışdı”.[10]

---

[8] “Əl-irşad”, s. 277.

[9] “Əlamul-vəra”, Əbu Əli Fəzl ibn Həsən Təbərsi, 298.

[10] Xətib Bağdadi “Təqyidul-elm”, təhqiq: Məhəmməd Əbülfəzl İbrahim, c. 15, s. 273.

“Əş-şuzuratuz-zəhəb” kitabında belə yazılır: “O Həzrət saleh, abid, səxavətli, səbirli və uca məqama sahib idi”.[11]

Məşhur nəsəbşünas Yəhya ibn Həsən ibn Cəfər o Həzrət barədə belə yazır: “Musa ibn Cəfərə (ə) ibadət və ictihadına görə “saleh bəndə” deyirdilər”.[12]

Bu fikirlər şiə və sünni raviləri və tarixçilərinin İmam Kazim (ə) haqqında dediklərindən yalnız bir neçə nümunədir.

İmam Kazımın (ə) səciyyəvi cəhətləri arasında ən çox diqqəti çəkən o Həzrətin səxavətli və kəramətli olmasıdır. Onun bu xüsusiyyəti hətta zərbül-məsəl olmuşdu. İbn Ənbə bu barədə yazır: “O Həzrət özü ilə daim qızıl kisələr gəzdirər və onları qarşılaşdığı fəqirlərə və ya onun ehsanına göz dikənlərə bağışlayardı, hətta o Həzrətin qızıl kisələri dillər əzbəri olmuşdu”.[13]

Məşhur rical alimlərindən olan Zəhəbi İmam Kazım (ə) haqqında belə yazır: “Musa ibn Cəfər (ə) hikmət sahiblərinin ən əliaçığı və Allah bəndələrinin ən təqvalısı idi”.[14]

Zahidlik və ibadət də o Həzrətin digər diqqətçəkən xüsusiyyətlərindən idi. İmam Kazımın (ə) həyatı uzun illər zindanda keçmiş və bu müddət ərzində O, Allaha ibadətlə məşğul olmuşdu. Belə ki, İmam Sadiq (ə) şəhid olan zaman dövrün xəlifəsi Mənsur Dəvaniqi öz hakimiyyətinin son günlərini yaşayırdı. Abbasi xəlifələrindən olan Mənsur elə bir adam idi ki, öz hakimiyyət dayaqlarını möh-

[11] “Təhzibüt-təhzib”c. 1, s. 304.
[12] “Təhzibüt-təhzib”, c. 1, s. 339.
[13] “Umdətut-talib”, s. 196.
[14] “Mizanül-etidal”, c. 4, s. 201.

kəmlətmək üçün bir sıra nüfuz sahibi olan insanları aradan götürürdü. 20 yaşlı gənc İmam Kazim (ə) atasının vəfatından sonra İslam hökümətinin xəlifəsi olan Mənsur kimi qəddar bir hakimlə üzləşdi.

Ərəb xilafətinin həmin dövrü daha çox repressiyalarla müşayiət olunduğundan İmam Kazım (ə) da atası və babası kimi öz dövrü üçün daha əhəmyyətli və təhlükəsiz olan elm yolunu seçdi. O bəşəriyyətin xilası naminə kiçik bir elm ocağında fəzilətli şəxsiyyətlər yetişdirməyə başladı. Eyni zamanda dövrünün xəlifələrinin ədalətsizliyi, zorakılıqları müqabilində İmam (ə) öz etirazını bildirməkdən çəkinmir, ədalət uğrunda mübarizə aparırdı. Zahiri hakimiyyət və qüdrət o dövrün xəlifələrinin əlində olsa da, mənəvi hakimiyyət imamların idi. Qəlblərə hakim olmaq isə ancaq İmam Kazıma (ə) məxsus idi. Mübariz və açıqfikirli müsəlmanlar öz malının xümsünü, həmçinin beytülmala mənsub olan digər vergiləri də zəmanə İmamı olan İmam Kazımın (ə) hüzuruna göndərirdilər.

# NƏ ÜÇÜN İMAMA (Ə) "KAZIM" LƏQƏBİ VERİLDİ?

Dostlarından biri İmamın (ə) səbr və dözümü barədə belə demişdir: "Həzrət (ə) həmişə öz nümunəvi əxlaqi ilə düşməni utandırardı".

Mədinədə bir kişi var idi ki, nə zaman İmamı (ə) görsəydi qabağını kəsib ona nalayiq sözlər deyərdi. Bir gün dostları İmama (ə) ərz etdilər ki: "Yəbnə Rəsulillah (ə), icazə ver, biz onu tənbeh edək". İmam (ə) buyurdu: "Onunla işiniz olmasın". Bu söhbətdən bir neçə gün keçdi, həmin kişidən xəbər çıxmadı. İmam (ə) onun harada olduğunu soruşduqda, səhabələr dedilər ki, o, Mədinə çölündəki tarlasına gedib. Bunu eşidən İmam (ə) həmin tarlaya getdi. Tarlada işləyən həmin kişi İmamı (ə) uzaqdan görüb səsləndi: "Mənim tarlama girmə! Mən səni və sənin ata-babanı özümə düşmən bilirəm". İmam (ə) ona yaxınlaşıb salam verdi və mehribanlıqla sual etdi: "Bu tarlaya nə qədər xərcləmisən?" Kişi dedi: "Yüz dinar". İmam (ə) sual etdi: "Nə qədər gəlirin olacağına ümid edirsən?" Kişi dedi: "İki yüz dinar". İmam Kazım (ə) içində 300 dinar olan bir kisəni çıxarıb ona verdi və buyurdu: "Bu pulu al, tarlan da özünə qalsın". Uzun illər İmamı (ə) təhqir edən həmin kişi belə bir hadisənin olacağını gözləmirdi. Bu hadisədən utanan kişi İmamın (ə) əlindən öpdü və ondan üzr istədi. İmam (ə) Mədinəyə qayıtdıqdan sonra buyurdu: "Şəri özünüzdən belə uzaqlaşdırın".

Bu hadisədən sonra İmama (ə) "Kazım" ləqəbi verildi. "Kazım" sözünün mənası qəzəbləndiyi zaman qəzəbini udan deməkdir.

## İMAMIN ƏXLAQİ KEYFİYYƏTLƏRİ

Məsumlardan bizə gəlib çatan rəvayətlərdən birində deyilir: “Qohumların arasında nə qədər düşmənçilik olsa da, əgər bir-birləri ilə qarşılaşdıqları zaman əl verib görüşsələr, düşmənçilikləri aradan qalxar, hamısı dinclik və şadlıq içində yaşayar”.

İbni Şəhr Aşub belə nəql edir: “Bir gün Abbasi xəlifəsi Mənsur İmam Kazımı (ə) saraya dəvət edib əmr etdi ki, Novruz bayramı günü xəlifəyə gətirilən hədiyyələri təhvil alsın. İmamın (ə) bu işə razılığı olmasa da, məcburiyyət qarşısında qəbul etməli oldu. Rəsmi qarşılanma mərasimində iştirak edən böyüklər və zadəganlar Mənsurun əmri ilə hədiyyələri o Həzrətə (ə) təhvil verirdilər. Bir nəfər də Mənsurun tərəfindən orada durub gətirilən hədiyyələri siyahıya alırdı. Axırda bir qoca gəlib dedi: “Ey Peyğəmbər övladı, mənim dünya malından hədiyyə etmək üçün heç bir şeyim yoxdur. Amma baban Hüseynin (ə) Kərbəla müsibətinə dair bir şeir yazıb sənə gətirmişəm”. Qoca kişi yazdığı şeiri oxudu. Onun bu şeiri İmama (ə) çox təsir etdi. Həzrət (ə) Mənsurun məmuruna əmr etdi ki: “Get Mənsurdan soruş gör bu hədiyyələri nə edəcək?”. Məmur gedib qayıtdıqdan sonra İmama (ə) dedi. Mənsur deyir ki, hədiyyələrin hamısını sizə bağışlayır, istədiyiniz adama verə bilərsiniz”. İmam (ə) həmin şeir yazan qoca kişiyə tə-

rəf dönüb belə buyurdu: “Babam Hüseynin (ə) müsibətlərinə dair yazdığın şeirə görə bu hədiyyələrin hamısını mən də sənə bağışlayıram ki, bu yoxsulluqdan qurtarasan”.

İmam (ə) həmişə özü öz məişətini təmin etmək üçün tarlada işləyər və heç kimsədən kömək istəməzdi. Bir gün Əli Bətaini adlı bir səhabəsi İmamı (ə) görmək üçün tarlaya gəldi. İmamı (ə) iş başında gördükdə ərz etdi ki: “Qurbanın olum, niyə bu işi başqa adamlara gördürmürsən?” İmam (ə) buyurdu: “Niyə başqalarına gördürürm? Halbuki, məndən daha yaxşı adamlar belə işlərlə məşğul olublar”. Əli Bətaini soruşdu: “O şəxsilər kimlərdir?” İmam (ə) buyurdu: “Allahın Peyğəmbəri (s), Əmirəl-möminin və bütün ata-babalarım. İşləyib-çalışmaq Allahın Peyğəmbərləri (ə) və vəsilərinin tutduğu ən düzgün yoldur və Allahın ləyaqətli bəndələri həmişə öz güzəranlarını təmin etmək üçün öz işlərini özləri görüblər”

Sanki şair İmamın (ə) belə yüksək əxaqi keyfiyyətlərini nəzərdə tutub bu şeiri yazmışdır:

*Əzəldən sevdiyim, əməkdir, işdir,*
*Hər ağac bir bağdan gətirilmişdir.*

# BİŞRİ-HAFİNİN TÖVBƏSİ

Günlərin bir günündə İmam Kazım (ə) küçədən keçəndə bir evdən çal-çağır səsi eşidir. Böyüklərdən sayılan ev sahibi özü üçün kef məclisi qurub əylənməklə məşğul imiş. Evin kənizi evdə olan zibilləri küçəyə atmaq üçün bayıra çıxır. İmamı (ə) görən zaman ona yaxınlaşıb salam verir. İmam (ə) ondan soruşur:“Bu evin sahibi bəndədir, ya azad insandır?” Kəniz deyir: “Azad insandır”**.** İmam (ə) buyurur: “Azad olduğu bəllidir. Əgər bəndə olsaydı, Allahdan qorxub bu işləri görməzdi”. Kəniz evə qayıtdıqdan sonra ağası ondan nə üçün gec gəldiyini soruşur. Kəniz əhvalatı olduğu kimi ağasına danışır. Ağası bir az duruxub İmamın (ə) sözləri barədə fikrə gedir. Birdən yerindən qalxıb ayaqyalın İmamın (ə) dalınca qaçır. Özünü İmama (ə) yetirib salam verir və öz əməlindən peşman olduğunu söyləyib İmamın (ə) hüzurunda tövbə edir. O gündən sonra kef məclisini ibadətgaha çevirir. Həmin günün xatirəsini əbədi yaşatmaq üçün o gündən etibarən ayaqyalın gəzməyə başlayır. Buna görə də o “Bişri-hafi” (ayaqyalın) ləqəbi ilə məşhur olur. Tövbə mövzusu tək Quran və hədislərdə deyil, həmçinin divan ədəbiyyatı nümunələrində də əks olunmuşdur. Buzovna Cümə məscidinin axundu Hacı Soltan Hüseynqulu oğlu Şah İsmayıl Xətaidən təxmisində bu mövzuya müraciət etmişdir:

*Tövbə ilə əfv olur aləmdə çox cürmü günah,*
*Hər iki aləmdə vardır çünki adil padişah.*
*Gər bəşər övladısan, olma Xudadan bipənah,*
*“Adəmin şənində “Kərrəmna” dedi niqti-İlah,*
*Əhli-mənasan, həqiqət sümmə-vəchullahi gör”.*

## İMAM KAZIMIN (Ə) ZİNDANA DÜŞMƏ SƏBƏBİ

Tarixi qaynaqların araşdırılması nəticəsində məlum olmuşdur ki, İmam Kazım (ə) özü zindanı seçmişdir. İmam Museyi-Kazımın (ə) atası, altıncı imamımız Cəfəri-Sadiq (ə) buyurmuşdur: "Təqiyyəsi olmayanın dini yoxdur". İmamın (ə) bu hədisinə zidd olaraq şiələr təqiyyənin əksinə hərəkət etmiş, sirlər açılmış və beləliklə, bəlaya layiq görülmüşlər. İmam Museyi-Kazim (ə) belə dua etmişdir: "Bu bəlanı şiələrdən uzaqlaşdır, mən özüm bunu öhdəmə götürürəm".

İmamın (ə) qarşısında iki ağır seçim var idi: ya könüllü olaraq Həzrəti-Yusif (ə) kimi zindan əzabını öz üzərinə götürməliydi, ya da özünü düşünərək azadlığı seçməli və şiələrin əzab çəkməsinə razı olmalıydı. Həzrət zindanı seçdi. Beləliklə, illərlə ən ağır işkəncələrə məruz qaldı.

Göründüyü kimi, Həzrətin (ə) nə qədər inayəti var imiş, nə qədər məhəbbəti var imiş, öz dostları, şiələri üçün nə qədər fədakar imiş! Allah-taala İmamın (ə) cəddinin hörmətinə bu inayəti bizim halımıza şamil etsin. Amin!

İmam (ə) 11 il zindanda qalmış, sonda zəhərlənərək şəhid olmuşdur. İmamın (ə) Kazımeyn məntəqəsində olan ziyarətgahı barədə oğlu İmam Rza (ə) belə buyurur: "Atam İmam Kazımın (ə) qəbrini ziyarət etmək, İmam Hüseynin (ə) qəbrini ziyarət etmək kimidir". (Şeyx Abbas Qumi.

"İmam Museyi-Kazımın (ə) həyatı" (tərc: Əbdül-Hüseyn) 2001.)

Bu bölümü İmam Kazımın (ə) bir hikmətli hədisi ilə yekunlaşdırırıq. İmam Museyi-Kazim (ə) buyurur : "Loğman oğluna dedi: "Dünya dərin dənizə bənzər, çox insanlar onda qərq olublar. Buna görə (xilas olmaq üçün) sənin bu dənizdə (mindiyin) gəmin gərək ilahi təqva, onun yükü iman, yelkəni təvəkkül, kapitanı ağıl, yol göstərəni elm və sükanı da səbr olsun".

# İMAM RZANIN (ə) ANASI TÜKTƏM XANIM (S.Ə)

İmam Rzanın (ə) anası haqqında belə yazırlar: “Əcəmin böyüklərindən olan İmam Kazımın (ə) anası Həmidə bir kəniz aldı və onu “Tüktəm” adlandırdı. O kəniz əql, həya və din baxımından İmama layiq qadınlardan idi. O, Həmidəyə çox ehtiram göstərirdi. Bir gün Həmidə onu övladı İmam Kazıma (ə) bağışladı və məsləhət gördü ki, onunla ailə qursun. İmam Kazım (ə) bu məsləhəti qəbul etdi.

İbni Babəveyh mötəbər sənədlə Əli İbn Meysəmdən nəql edir ki, İmam Museyi-Kazımın (ə) anası Həmidə xanım əcəmlərin (ərəb olmayan) böyük şəxsiyyətlərindən sayılırdı. O, bir kəniz alıb adını Tüktəm qoydu. Bu kəniz ağıl, din və həya baxmından qadınların ən yaxşısı və sədaqətlisi idi. Tüktəm Həmidə xanıma layiqincə itaət edirdi. Belə ki, onu alan gündən Xanımın hörmətini saxlayar, onun yanında cəsarət edib oturmazdı. Günlərin bir günündə Həmidə xatun oğlu İmam Museyi-Kazıma (ə) dedi: “Ey əziz övladım! Tüktəm tayı-bərabəri olmayan bir kənizdir. Zirəklik və gözəl əxlaqda ondan yaxşı birisini görmədim. Bunu da bilirəm ki, ondan əmələ gələn hər hansı bir nəsil pak və təmiz olacaq. Onu sənə bağışlayır və səndən rica edirəm ki, ona ehtiram edəsən”.

İmam Museyi-Kazım (ə) həmin kənizlə evləndi, oğlu Əli (İmam Rza (ə)) dünyaya gələn zaman Tüktəmi “Tahirə” adlandırdı.

“Dürrün-nəzm” və “İsbatul-vəsiyyət” kitablarında yazılmışdır ki, İmam Museyi-Kazım (ə) Tüktəmi alarkən səhabələrindən bir dəstəsinə buyurdu: “And olsun Allaha! Mən bu kənizi yalnız Allahın vəhy əmri ilə aldım”. Səhabələr onun barəsində Həzrətdən (ə) soruşduqda buyurdu: “Yuxuda ikən atamın və babamın mənim yanıma gəldiklərini gördüm. Əllərindəki parçanı açdıqda bunun köynək olduğunu gördüm. İpək köynəkdə həmin kənizin şəkli çəkilmişdi. Atam və babam mənə buyurdular: “Ey Musa! Şübhəsiz ki, bu kənizdən, səndən sonra yer üzünün ən yaxşı övladı dünyaya gələcək”. Sonra mənə əmr etdilər: “O səadətli mövlud dünyaya gələn zaman adını Əli qoyarsan. Tezliklə aləmlərin Rəbbi onun vasitəsilə ədaləti və rəhməti zahir edəcəkdir. Xoş olsun onu təsdiq və qəbul edən şəxsin halına. Vay olsun onunla düşmənçilik edib, onu inkar edən şəxsə”.

Şeyx Səduq mötəbər sənədlə o Həzrətin anası “Nəcmə”dən (Tüktəmdən) nəql edir ki, O, demişdir: Əziz övladıma hamilə olarkən qətiyyən özümdə ağırlıq hiss etmirdim. Yuxuya gedərkən bətnimdə Haqq-təalaya həmd, şükr və təsbih edən bir səs eşidir və qorxuya düşürdüm. Yuxudan ayılarkən artıq səsi eşitmirdim. Səadətli övladım dünyaya göz açarkən, əllərini yerə qoyub mübarək başını göyə tərəf qaldırdı. Mübarək dodaqları tərpənir, nə isə deyirdi, lakin mən başa düşmürdüm. Bu zaman İmam Museyi-Kazım (ə) yanıma gəlib dedi: “Ey Nəcmə, Allah-təalanın lütf və kərəmi sənə nəsib olmuşdur”. Mən də səadətli övladımı bir ağ parçaya büküb Həzrətə (ə) verdim. Həzrət (ə) onun sağ qulağına azan, sol qulağına iqamə dedi. Sonra Fərat suyu istəyərək mübarək ağzını o su ilə açdı. Sonra

mənə verib: “Tut, bu Allahın baqi qalanı və məndən sonra yer üzündə Allahın hüccətidir” buyurdu.

İbni-Babəveyh mötəbər sənədlə Məhəmməd İbni-Ziyaddan nəql edir ki demişdir: İmam Rza (ə) anadan olan gün eşitdim ki, İmam Museyi-Kazım (ə) buyurdu: “Mənim bu övladım sünnət olunmuş, pak və pakizə halda doğulmuşdur. Lakin Peyğəmbərin (s) sünnəsinə itaət edərək biz də onun sünnət hissəsinə ülgücü fırladırıq”.

Şirinkəlam şairimiz “Kənzül-Məsaib” və “Gülzari-Hüseyni” əsərlərinin müəllifi, XIX əsrin görkəmli şairi Hacı Məhəmməd Təqi Qumri Dərbəndi İmam Rzanın (ə) anası Tüktəm xanımın dilindən İmamın Allaha olan məhəbbətini və yaşadığı dövrdə çəkdiyi iztirabları bir növhəsində belə qələmə almışdır:

*Ey verən canını min şövq ilə canana Rza,*
*Mülki-qürbətdə qalan xarü zəlilanə Rza.*
*Möhnətü cövrü cəfadən yetişən canə Rza,*
*Bəstəri xaki-siyəh, mənzili viranə Rza.*

*Çəxri-dövran sitəmindən çəkilib sinəmə dağ,*
*Qılmışam nalə konan sahəti-dünyani soraq,*
*Bu nə mənzildü veriblər sənə bifərşü çıraq,*
*Can verirsən quru yerlərdə zəlilanə, Rza.*

*Bu nə həngamədür, ey padişəhi-mülki-Hicaz,*
*Məni-dilxəstə ilən eyləgilən razü niyaz.*
*De, görüm dərdüvi bikəs anova, eyləmə naz,*
*Verəcək göz yaşım aləmləri tufanə, Rza.*

*Kəhrəba tək saralıb laleyi-gulrəngi-tərün,*
*Yoxdu bir baş açıb əfğanə gələn növhəgərün.*

*Görünür teştdə yetmiş iki parə cigərün,*
*Boyanıb lə`li-ləbün lalə kimi qanə, Rza.*

*Qıl bəyan, ey güli-gülzari-rəsuli-mədəni,*
*Nə səbəbdəndü salıblar belə əhvalə səni?!*
*Biri qürbətdə öləndə məgər olmaz kəfəni?*
*Quru yer mənzil olur Tusdə mehmanə, Rza.*

*Netmisən dəhrdə Məmuni-ləinü şumə,*
*Eyləyübdür bu qədər zülm səni-məzlumə?*
*Harda qalmış məgər istəkli bacun Mə`sumə?*
*Baş açıb, nə`şivün üstə gələ əfğanə, Rza.*

*Dutmuşam Kufədə al qanə batan Heydərə yas,*
*Düşmüşəm çöllərə, əgnimə geyib qarə libas.*
*Gəh "Hüseyn vay" deyərəm, gah deyib "va Əbbas",*
*Ağlaram Qasimilən Əkbəri-ətşanə, Rza.*

*Nə qarabəxt anayam, gülməz üzüm dünyadə,*
*Gəlirəm nalə konan şamü səhər fəryadə.*
*Gəh Bəqiyə gedərəm, gah, oğul, Bağdadə,*
*Gah gəlləm baş açıq mülki-Xorasanə, Rza.*

*İmdi əfğanə gətirrəm fələkin noh taqın,*
*Eylərəm növhəsəra şeş cəhətin afaqın.*
*Sinən üstə qoyaram Kərbübəla topraqın,*
*Mədfənün rəşk verir cənnəti-rizvanə, Rza.*

*Çəkmə ğəm, mən sənə aləmdə əzadar ollam,*
*Ağlayıb qürbət ara, dərdüvə qəmxar ollam.*
*Yetişib dadınə, əlbəttə, mədədkar ollam,*
*Həşrdə Qumriyi-dilxəsteyi-nalanə, Rza.*

## XANIM FATİMEYİ-MƏSUMƏNİN (S.Ə) HƏYATI

Həzrəti-Fatimeyi-Məsumə (s.ə) hicrətin 173-cü ili Zilqədə ayının 1-də müqəddəs Mədinə şəhərində dünyaya göz açmışdır. Anası Həzrəti-Fatimeyi-Zəhranın (s.ə) isməti, şərafəti onda təcəlli etmişdir (çiçəyidir). Xanım Məsumə (s.ə) cənnət qadını, ibadət və yalvarışın iksiri, çirkinliklərdən uzaq, yaradılışın gözəl qoxulu şəbnəmidir. Atası Bağdadda xilafəti qəsb etmiş Harun Rəşidin (lənətullahi-əleyh) əmri ilə zindanda şəhid edildikdən sonra böyük qardaşı İmam Rza (ə) bacı və qardaşlarının təhsil, tədris və tərbiyəsini öz öhdəsinə götürmüşdür.

İmam Museyi-Kazımın (ə) uşaqları arasında İmam Rzadan (ə) sonra Məsumə xanımın ən uca məqama çatan olduğu bildirilir. Dini ədəbiyyatdan başqa istər klassik ədəbiyyatda, istər aşıq ədəbiyyatında bu əzəmətli xanım barədə bir çox müəlliflər böyük ehtiramla söhbət açmış, onu da məsum imamlar qədər məhəbbətlə vəsf etmişlər. Buzovna qəsəbəsi Cümə məsçidinin axundu Hacı Soltan Hüseynqulu oğlunun Həzrəti-Məsumənin (s.ə) mövludu münasibətilə yazdığı şeiri bu qəbildən olan yüzlərlə nümunədən biri olaraq təqdim edirik:

*Sevinc yaşın bəxşiş eyləyib gözə,*
*Məsumənin mövluduna gəlmişik.*

*İmam Rza dəvət veribdir bizə,*
*Məsumənin mövluduna gəlmişik.*

*Bu kimsənə imamın baş tacıdır,*
*Qardaşının dərdinin əlacıdır.*
*Qətl olunan bir qəribə bacıdır,*
*Məsumənin mövluduna gəlmişik.*

*Gəlmişik ki, şad eyləyək İmami,*
*Qəlbimiz də bəlkə tuta arami.*
*Düzüb dalbadala nəfis kəlami,*
*Məsumənin mövluduna gəlmişik.*

*O göstərib əhdə etibarlığın,*
*Qardaşına məhəbbətin varlığın.*
*Söyləməyə ərzimiz var bir yığın,*
*Məsumənin mövluduna gəlmişik.*

*Soltan, qiyamətdə haqqü hesabdır,*
*Bu gün şadlıq hər suala cavabdır.*
*Bayram günü bayram etmək savabdır,*
*Məsumənin mövluduna gəlmişik.*

Həzrəti-Fatimeyi-Məsumə (s.ə) çirkinliklərdən uzaq, ən gözəl əxlaqi və davranış sifətlərinə sahib olan, kəramətli bir xanım olmuşdur. Eyni zamanda elm və təqvada, böyüklükdə bənzərsiz olmuş, bu yüksək məziyyətləri ilə cəza gününün şəfaətçisi məqamına yüksəlmişdir. O, Kərbəla qəhrəmanı Həzrəti-Zeynəb (s.ə) kimi əsirlik həyatı yaşa-

yaraq İslam dinini və Əhli-beyt (ə) düşmənlərinin həqiqi üzünü açıb ortaya qoymuşdur. Həzrəti-Məsumənin (s.ə) atası 7-ci İmam Həzrəti-Museyi-Kazım ibn Cəfər (ə) ibn Mühəmməd ibn Əli ibn Hüseyn ibn Əlidir, anası iffət, iman, təqvasıyla tanınan və islami elmlərə vaqif, Afrika əsilli Nəcmə xatun adında möhtərəm bir xanımdır. Xanım Məsumənin babası tərəfdən İmam Mühəmməd Baqirin (ə), anası tərəfdən İmam Həsənin (ə) nəslinə çatdığı bildirilir. Onu da qeyd edək ki, Həzrəti-Fatimeyi-Məsumə (s.ə) ilə İmam Rza (ə) digər bacı qardaşlarına nisbətdə həm atadan, həm də anadan bir bacı-qardaşdırlar.

**Adı və ləqəbləri.** Həzrətin adı Fatimə, məşhur ləqəbi isə Məsumədir. Bu ləqəbi ona böyük qardaşı Həzrəti-İmam Rza (ə) verib. Mötəbər sənədlərə əsasən, ona bu ləqəb günahsız və məsum olduğu üçün verilib. Digər ləqəbləri isə aşağıdakılardan ibarətdir: Tahirə, Həmidə, Bərrə, Rəşidə, Təqiyyə, Nəqiyyə, Rəziyyə, Mərziyyə, Seyyidə, Üxtür-Rza və Babül Həvaicin qızı.

İmam Kazımın (ə) övladları arasında Fatimə adı ilə dörd qız uşağı qeydə alınıb: Fatimeyi-Kubra 2.Fatimeyi-Suğra 3.Fatimeyi-Vüsta 4.Fatimeyi-Üxra. Qeyd etmək lazımdır ki, Həzrəti-Məsumə (s.ə) həmin Fatimeyi-Kubradır. Onun müqəddəs məzarını ziyarət edənlər də, "Məsumeyi-Qumi" ləqəbi ilə tanınır. Fatimeyi-Suğra isə Həkimə xanımdır, "Bibi-Heybət" adı ilə tanınır. Onun məzarı Azərbaycanın Bakı şəhərinin cənub girəcəyindədir və hər gün yüzlərlə insan həmin məzarı ziyarət edir. Fatimeyi-Uxra isə tarixdə "İmam bacısı" ləqəbi ilə məşhurlaşıb. O, İran İslam Respublikasının Rəşt şəhərində dəfn olunub və

müqəddəs məzarı xalqın ziyarətgahıdır. "Sitti-Fatimə" ləqəbi ilə tanınan Fatimeyi-Vüsta İran İslam Respublikasının İsfahan şəhərində dəfn edilib və onun məzarı da ziyarətgahdır. Fatimeyi-Məsumə (s.ə) bacıları arasında ən böyüyü olduğu üçün "Fatimeyi-Kubra" adlanıb.

Mərhum Ayətullah Mustənbit və 15-ci əsrin böyük tədqiqatçılarından biri olan Saleh ibn Ərəndəs belə yazır: "İmam Museyi-Kazımın (ə) dövründə bir qrup şiə təriqətinə mənsub olan insanlar suallarına cavab tapmaq məqsədi ilə Mədinə şəhərinə gedirlər. İmam Kazim (ə) səfərdə olduğundan, şiələr suallarını kağıza yazaraq İmam Museyi-Kazımın (ə) ailə üzvlərinə təqdim edib öz şəhərlərinə dönmək fikrində olduqlarını bildirirlər, növbəti səfərdə suallarının yazılı cavabını ev sahiblərindən alacaqlarını deyərək, İmamın ailəsi ilə vidalaşırlar. Vətənlərinə qayıtmaq istəyən zaman Həzrəti-Məsumə (s.ə) tərəfindən suallara cavab yazıldığını gördükdə sevincək yazını xanımdan alıb, şəhərlərinə tərəf dönürlər. Yolda İmam Museyi-Kazımla (ə) rastlaşan şiələr macəranı İmama tərif edirlər. İmam (ə) yazını onlardan alır və diqqətlə oxuyur, cavabların düzgün olduğunu gördükdə üç kərə buyurur: "Atası ona qurban olsun". Həzrəti-Məsumənin (s.ə) qeyd olunan hadisə zamanı 8-9 yaşlarında olmasına diqqət yetirsək, onun İslam maarifinə nə dərəcədə yiyələndiyinin və elminin nə dərəcədə yüksək olduğunun şahidi oluruq. Bununla yanaşı Xanım Məsumə (s.ə) həm də mühəddisə və raviyədir (rəvayət nəql edən xanım). O Xanım babası İslam Peyğəmbərindən və məsum imamlardan (ə) bir çox hədislər nəql edib: "Həzrəti-Məsumə (s.ə) Xanım Fatimeyi-Zəhradan

(s.ə), o da atası Həzrəti-Rəsulullahdan (s) belə nəql edir: "Aya, siz Rəsulullahın "Qədir-Xum" çölündə "Mən kimin rəhbəriyəmsə, Əli də onun rəhbəridir" buyurduğunu və həmçinin: "(Ey Əli!) Sənin mənim məqamıma olan nisbətin Harunun Musaya (ə) olan nisbətidir" kəlamını unutmusunuz? Agah olun, hər kim Mühəmmədin (s) ailəsinə qayğı bəsləyərək dünyadan köçüb gedərsə şəhid sayılır".

**İran səfəri.** Abbasi xəlifələrinin 7-ci xəlifəsi olan Məmun (Allahın lənəti ona olsun) şiələrin qiyamını yatırtmaq məqsədilə, Həzrəti-İmam Rzanı (ə) Mədinədən Xorasana dəvət etdi. Hicri-qəməri tarixinin 200-ci ilində İmam Rza (ə) Məmunun israr və hədələrindən sonra qohum-əqrəbasız Mərvə (indi Türkmənistan Respublikasının şəhəridir) tərəf getməyə məcbur oldu. Qardaşından ayrı düşən Həzrəti-Məsumə (s. ə) Hicrətin 201-ci ilində, İmam Rzanı (ə) görmək üçün, yaxın adamlarından ibarət 400 nəfərlik bir dəstə ilə Mədinədən Xorasana doğru hərəkət etdi. Keçdikləri bütün şəhər və məntəqələrdə camaat onları təntənə ilə qarşılayır, məhəbbət göstərirdilər. Məsumə xanım, hansı şəhər və kəndə çatırdısa, qardaşı İmam Rzanın (ə) zülmkar padşahların əlinə əsir düşdüyünü və qəsbkar "Əbbasi sülaləsinə" qarşı olduğunu və "vəliəhdliyi" məmləkətin siyasi işlərinə müdaxilə etməmək şərti ilə qəbul etməsilə bir daha zülmə qarşı apardığı mübarizəni davam etdirdiyini söyləyirdi.

Həzrəti-Məsumənin (s.ə) olduğu karvan İranın Savə şəhərinə çatdıqda, artıq Əhli-beyt (ə) düşmənləri xalqın (sünni və şiə camaatının) Əbbasi sülaləsinə qarşı qiyamlara yenidən əl atacaqlarından qorxaraq, karvana hücum et-

dilər. Baş verən amansız qarşıdurmada xeyli sayda insan həlak oldu. Hətta tarix qeyd edir ki, Həzrəti-Məsumənin (s.ə) qardaşı və qardaşı oğlanlarından 23 nəfəri şəhid edildi. Ravilərin yazdığına görə, düşmən qüvvələri Həzrəti-Məsuməni (ə) zəhərləməyə də nail olmuşdular. Bəzi tarixçilər isə Həzrəti-Məsumənin (s.ə) bu hadisədən xəbərdar olduqda keçirtdiyi hüzn və kədər nəticəsində şiddətli bir şəkildə xəstələndiyini yazırlar. Hər halda o ya çoxlu qəm-qüssədən, ya da zəhərlənmə nəticəsində xəstələnib Xorasana gedə bilməmişdir. Xanım Məsumə (s.ə), "Burayla Qum şəhəri arasındakı məsafə nə qədərdir?" soruşdu. "On fərsəx" deyə cavab verildi. Xanım Məsumə (s.ə) daha sonra "Məni Quma aparın" deyə buyurdu və sözlərinə bunu əlavə etdi ki, "Mən atalarımdan eşitmişəm ki, Qum şəhəri bizim şiələrimizin pənahgahıdır".

Həzrəti-Məsumə (s.ə) və onunla gələnlər hicri-qəməri tarixi ilə 201-ci ildə rəbiəl-əvvəl ayının 23-də Qum şəhərinə çatırlar. Nəql olunan səhih hədislərə görə, Xanım Məsumə (s.ə) Qum şəhərinə daxil olduqda, onu Qumun ağsaqqallarından biri olan Əşəri qəbiləsinin başçısı Musa ibn Xəzrəci və Qum əhalisinin sıx bir toplumu qarşılamışlar. Həzrəti-Məsumə (ə) Quma daxil olur, Musa ibn Xəzrəcin evinin qapısında kəcavədən enib onun evində qonaq qalır. 17 gündən artıq qalmadığı həmin evdə vaxtını, demək olar ki, ibadətlə keçirir. Həmin yer hal-hazırda "Beytun-nur" adı ilə tanınır və nəzdində ziyarətgah və "Sitiyyə" qızlar mədrəsəsi yerləşir.

## HƏZRƏTİ-MƏSUMƏNİN (S.Ə) KƏRAMƏTLƏRİ

Mərceyi-təqlid mərhum Ayətullah Ərakidən nəql edirlər ki, onun əlində dərinin quruluğu nəticəsində çoxlu çatlar əmələ gəlibmiş. Dəstəmaz almaq onun üçün qeyri-mümkün olubmuş. O, həkimə müraciət etsə də, müalicələr alsa da, bunun heç bir faydası olmur ki, olmur. Elə buna görə də, ibadətlərini təyəmmüm ilə yerinə yetirir. Ayətullah Əraki deyir ki, mən bir gün hərəmə gedib Həzrəti-Məsuməyə (s.ə) təvəssül etdim. Təvəssül edərkən mənə ilham olundu ki, əllərivin için parça ilə ört. Mən də əllərimin içini parça ilə örtdüm və elə həmin andan bəri xanımın bərəkəti sayəsində əllərim şəfa tapdı.

Azərbaycandan uşağını, boğazındakı xərçəng xəstəliyinə görə, Təbrizə müalicəyə gətirən xanıma həkimlər deyirlər ki, uşağın boğazındakı şiş cərrahiyyə yolu ilə kəsilib götürülməlidir. Lakin uşaq körpə olduğu üçün əməliyyat üçün verilən ümumi keyitmədən (narkoz) ayılma və əməliyyatdan sağ çıxma ehtimalı 10 % dir. Ümüdü üzülən ana, körpəsini xəstəxanadan çıxardaraq bir başa terminala gedib, Quma bilet alaraq Həzrəti-Məsumənin (s.ə) ziyarətinə gəlir. Ana deyir: “Həzrəti-Məsumənin (s.ə) hərəminə daxil olub xanımın zərihi ilə üzbəüz duraraq körpə balamın şəfa tapmasını Xanımdan ağlaya-ağlaya istədim. Bir müddət keçməmişdi ki, qızımın boğazındakı şişin Həzrəti-Məsu-

mənin (s.ə) kəraməti sayəsində öz-özünə partlayaraq daxilindəki pisliklərin çölə çıxdığının şahidi oldum". Hərəmin xadimləri deyirlər ki, bir ildən sonra ana körpə balası ilə yenidən Xanım Məsumənin (s.ə) ziyarətinə gəldikdə şişdən heç bir əsər, əlamət qalmamışdı.

# HƏZRƏTİ-MƏSUMƏNİN ŞƏHADƏTİ, DƏFNİ, MÜQƏDDƏS MƏZARI ÜZƏRİNDƏKİ ZƏRİHİN TARİXÇƏSİ VƏ XANIMI (S.Ə) ZİYARƏT ETMƏYİN FƏZİLƏTİ

Rəvayətlərə görə, Xanım Məsumə (s.ə) rəbiüs-sani ayının 10-u hicri-qəməri tarixi ilə 201-ci ildə, 28 yaşında qardaşı İmam Rzanı (ə) görmədən qürbətdə böyük qəm-qüssə ilə dünyasını dəyişmiş və şiələri matəmə qərq etmişdir. Xanım Məsumə (s.ə) dünyasını dəyişərkən subay olmuş, ailə həyatı qurmamışdır. Qumun əhalisi onu dəfn etmək üçün "Babulan" bağına aparmışlar. Qəbir hazır olandan sonra onun kim tərəfindən dəfn edilməsi barəsində tərəddüd yarandıqda, bu zaman qiblə səmtindən üzlərinə niqab bağlamış iki atlının sürətlə onlara tərəf yaxınlaşdığını görmüşlər. Gələnlər cənazəyə namaz qıldıqdan sonra biri qəbrin içərisinə daxil olmuş, o birisi cənazəni götürüb ona vermişdir. Hər ikisi dəfn mərasimini başa çatdırıb, kimsə ilə danışmadan, atlarına minib oradan uzaqlaşmışlar. Həmin iki nəfərin kimliyi oradakılara məlum olmasa da, onların Allah-təalanın iki höccəti İmam Rza (ə) və İmam Cavad (ə) olması ehtimal edilir.

Dəfn mərasimdən sonra Musa ibn Xəzrəc Məsumənin (s.ə) müqəddəs qəbri üzərində qamış həsirlə bir kölgəlik düzəltmişdir. Bundan sonra 9-cu İmam, Həzrəti-Məhəmməd Cavadın (ə) qızı Zeynəb (s.ə) hicri-qəməri tarixi ilə 256-cı ildə Xanım Məsumənin (s.ə) qəbri üzərində ilk dəfə günbəz

ucaltmışdır. Bir müddətdən sonra Xanımın qəbri kənarında bir neçə imamzadə torpağa tapşırılmış və onlar üçün əlavə iki günbəz tikilmişdir. Beləliklə, üç konusvari günbəz yaranmışdır. Hicri-qəməri tarixi ilə 447-ci ildə günbəzin üçü də birləşdirilmiş, kürəvi şəkildə vahid günbəz halına salınmışdır. Günbəz müxtəlif kirəmitlə bəzədilərək al-əlvan rənglərlə boyanılmışdır. Hicri-qəməri tarixi ilə 925-ci ildə günbəz yenidən təmir edilmış, xarici səthi mozaiklə bəzədilmış, əlavə olaraq iki minarə və böyük bir eyvan da tikilmişdir. Hicri-qəməri tarixi ilə, 1218-ci ildə ilk dəfə olaraq Xanımın hərəminin günbəzi qızıl lövhələr ilə bəzədilmişdir.

Hicri tarixi ilə 965-ci ildə Şah Təhmasib Səfəvi Həzrəti-Məsumənin (s.ə) məzarı üzərində kərpicdən zərih düzəldilməsinə göstəriş verir. Zərih düzəldilmiş, yeddi rəngli kirəmitlə bəzədilmiş və üzərində yazı yazılmışdır. Məzarın görünməsi və zəvvarlar nəzirlərini zərihin daxilinə ata bilmələri üçün zərihin ətrafında dəliklər açılmışdır. Hicri-qəməri tarixi ilə 1230-cu ildə Fətəli Şah həmin zərihin üzərinə gümüş çəkdirmişdir. Hicri-qəməri tarixi ilə 1380-ci ildə zərihin üzərindəki köhnə gümüşlər daxil olmaqla şahın xəzinəsindən də bir miqdar gümüş götürülərək yeni zərih düzəldilmişdir. Zərih illər boyu xanımın pak məzarı üzərində qalıb, dəfələrlə təmir olunmuşlur. Nəhayət, Hicri-şəmsi tarixi ilə 1368-ci ildə (1989-cu ildə) Hərəmin müdiriyyəti tərəfindən zərihin yenilənməsi göstərişi verilmiş və daha nəfis şəkildə düzəldilmiş zərih Həzrəti-Məsumənin (s.ə) məzarı üzərinə qoyulmuşdur. Hicri-şəmsi tarixi ilə 1380-ci il İsfənd ayında (miladi tarixi ilə 2002-ci il fevral-mart aylarında) zərih üzərində yenidənqurma işləri aparılmışdır. Qədim zərih isə Həzrəti-Məsumənin (s.ə) hərəminin xəzinəsinə təhvil verilmişdir.

Peyğəmbəri-Əkrəm (s) buyurub: “Hər kəs məni vəfatımdan sonra ziyarət etsə, sanki, məni diriliyimdə ziyarət edib! Fatiməni ziyarət edən, sanki, məni ziyarət edib! Əli ibn Əbu Talibi ziyarət edən, sanki, Fatiməni ziyarət edib! Həsən və Hüseyni ziyarət edən, sanki, Əlini ziyarət edib! Onların övladlarını ziyarət edən, sanki, Həsən və Hüseyni ziyarət edibdir!”

İmam Rza (ə) buyurub: “Qum şəhərində Məsuməni (s.ə) ziyarət edən, sanki, məni ziyarət edib!”

İmam Sadiq (ə) buyurub: “...Bilin ki, Qum kiçik Kufədir! Bilin ki, behiştin səkkiz qapısı vardır və onun üç qapısı Qum şəhərinə açılacaq. Orada oğlum Musanın qızı Fatimə adlı nəvəm vardır və onun şəfaəti sayəsində bütün şiələrim behiştə daxil olacaq!”

İmam Sadiq (ə) yenə də buyurmuşdur: “Allahın hərəmi Məkkə, Peğəmbərin (s) hərəmi Mədinə, Əmirəl-möminin Əlinin (ə) hərəmi Kufədir! Bizim də hərəmimiz vardır və o, Qum şəhəridir. Tezliklə övladlarımın uşaqlarından Fatimə adlı bir nəvəm orada dəfn olunacaq. Kim onu ziyarət etsə, behişt ona vacibdir!”

İmam Rza (ə) buyurub: “Onu (Xanım Məsuməni) mərifətlə ziyarət edən behişti qazanar!”

Xanım Məsumənin (s.ə) haqqını tanımaq ziyarətin əsas şərtidir. Xanım Fatimeyi-Məsuməni (s.ə) kamil sürətdə ziyarət etmək o xanımın haqqını tanımaqdadır. Buna görə də, Həzrəti-Fatimeyi-Məsumənin (s.ə) hüquqlarının bir qismini açıqlayırıq:

1. O xanıma, həmçinin Peyğəmbərin (s) ailəsinə (ə) məhəbbət və məvəddət bəsləmək. (Xanım Məsumə (s.ə) 14 Məsumdan biri olmasa da, bu pak ailənin ən əziz

üzvlərindəndir.)

2. Onun və pak əcdadlarının (ə) düşmənlərinə nifrət bəsləmək və onlardan uzaq olmaq.

3. Xanımı hər an böyük bir şəxsiyyət bilmək və daim ona böyük gözlə baxmaq, hərəminə daxil olduqda ziyarətin qayda və qanunlarına əməl etmək.

4. O Xanımın, Allah-təala, Həzrəti-Rəsulullah (s) və məsumlar (ə) yanındakı ali məqam və mənzilətinə iman gətirmək.

5. Həqiqətən də, Xanım Məsuməni (s.ə) ziyarət edən şəxs cənnətə daxil olmağa layiqdir. Çünki Xanım Məsumə (s.ə) şəfaət etmək hüququna malikdir. Belə ki, Allah-təalanın razılığı olmadan, heç kimsə bu hüquqa malik ola bilməz.

İslam dininin böyük alimləri bu Xanımın qarşısında ədəbə riayət edir, onu ziyarət etməyə səy göstərirlər. Onlar hətta xanımın müqəddəsliyinin müdafiəsinə qalxaraq bu yolun çətinliyinə sinə gərmişlər. Bütün bunlar alimlərimizin Həzrəti-Məsuməyə (s.ə) olan ehtiram və rəğbətindən irəli gəlir. Şiə aləminin fəxri, mərhum Ayətullah Seyyid Brucerdi haqda deyilir ki, vəhhabi rejimi olan Səudiyyə Ərəbistanının padşahı İrana səfər etdiyi zaman Qum şəhərinə gəldikdə Ayətullah Brucerdi ilə görüşmək istəyib. Seyyid Brucerdi ağa bu görüşdən imtina edib. Ayətullah Seyyid Brucerdidən görüşdən imtina etdiyinin səbəbini soruşduqda belə cavab verib: “Bu adam Əhli-beyti (ə) qəbul etmir, ona görə də, Quma mənim ziyarətimə gəlib, amma Xanım Məsumənin (s.ə) ziyarətinə getmir. Əgər o, Xanım Məsuməni (s.ə) ziyarət etmirsə, deməli ona hörmətsizlik edir. Mən isə bu hörmətsizlik qarşısında sükut edə bilmərəm”.

# XANIM ZEYNƏB İLƏ (S.Ə) HƏZRƏTİ-MƏSUMƏNİN (S.Ə) OXŞAR CƏHƏTLƏRİ

1. Hər iki xanım məsum İmamın (ə) qızıdır. Xanım Zeynəb (ə) Həzrəti-Əlinin (ə), Həzrəti-Məsumə (s.ə) isə İmam Musa ibn Cəfərin (ə) qızıdır.

2. Hər iki xanım məsum şəxslərin bacısıdır. Biri Həsən (ə) və Hüseynin (ə), digəri isə İmam Rzanın (ə) bacısıdır.

3. Hər iki xanım Allahın höccəti olan məsum İmamlardan (ə) bəhrələnmişdir.

4. Hər iki xanım məsum İmamlar (ə) tərəfindən hörmətə layiq görülmüşdür.

5. Hər iki xanım öz qardaşlarını – Xanım Zeynəb (s.ə) qardaşları İmam Həsəni (ə) və İmam Hüseyni (ə), Həzrəti-Məsumə (s.ə) isə qardaşı İmam Rzanı (ə) çox sevirdi.

6. Hər iki xanım İslam dininə və Əhli-beytə (ə) olan məhəbbətlərinə görə evlərini, yaşayışlarını və vətənlərini tərk edərək, səfər əziyyətlərinə qatlaşmışlar. Həzrəti-Zeynəb (s.ə) Mədinədən İraqa, sonra isə Şama getdi. Həzrəti-Məsumə (s.ə) isə Mədinədən İrana getdi, Qumda yaşadı, orada da vəfat edib dəfn olundu.

7. Hər iki xanımın vətəni Mədinə olduğu halda, qürbətdə dəfn olunublar. Həzrəti-Zeynəb (s.ə) Şamda (indiki Dəməşq), Həzrəti-Məsumə (ə) isə Qumda dəfn olunub.

8. Hər iki xanımın qəbri müsəlmanların ümumi ziyarətgahına çevrilib.

Allahın salamı olsun Zeynəbi-Kubraya (s.ə), Həzrəti-Məsuməyə (s.ə) və Allah yolunun bütün fədakarlarına ki, bu böyük xanımlardan dərs alaraq, səbr etməyi öz həyat dəftərlərinin sərlövhəsinə yazıblar.

## AZƏRBAYCAN ƏRAZİSİNDƏ İMAM RZANIN (Ə) BACILARININ MÜQƏDDƏS ZİYARƏTGAHLARI

İmam Museyi-Kazım (ə) imamların arasında övladlarının sayına görə birinci yerdə durur. Onun 37 (19-u qız olmaqla) yaxud 60 (37-si qız olmaqla) övladı olduğunu yazırlar. "Musəvi" nəsəbli seyidlər nəsli İmam Mueyi-Kazimin (ə) törəməsidir. İmamın (ə) övladlarının çoxu İran və ona bağlı olan ərazilərdə vəfat edib dəfn olunmuşlar. Bu da İmam Rzanın (ə) Tusa gətirilməsindən sonra qardaş və bacılarının Onu görmək üçün İrana gəlmələri ilə bağlıdır. İmam Kazımın (ə) oğullarından İmam Rza (ə) Məşhəddə, "Şahçıraq" ləqəbli Əhməd Şirazda, Səfəvilər nəslinin banisi Həmzə isə Reydə dəfn olunmuşdur. Qızlarından Həzrəti-Fatimeyi-Məsumənin (s.ə) Qum şəhərindəki məzarı böyük ziyarətgahdır.

Azərbaycan ərazisində musəvi seyidlərin olması bu nəslin nümayəndəlirinin Bakıda, Bilgəhdə, Mərdəkan və Nardaranda yaşamaları ilə əlaqədardır. Onların qəbirləri də müqəddəs yerlər hesab olunur.

## BİBİHEYBƏTDƏ HƏKİMƏ XANIM (S.Ə) ZİYARƏTGAHI

İmam Kazimı (ə) və İmam Rzanı (ə) Azərbaycanla bağlayan cəhətlərdən biri də möhtəşəm Bibi-Heybət ziyarətgahıdır. Bakı şəhərinin cənub-şərqində, Xəzər dənizi sahilində, keçmiş Şıxlar qəsəbəsinin ərazisində yerləşən bu ziyarətgahda İmam Rzanın (ə) bacısı Həkimə xanım (s.ə) dəfn edilib. Bəzi mənbələrdə onun adı Fatimeyi-suğra kimi xatırlanır. İmam Rzanın (ə) Fatimə adlı bir neçə bacısı olub. Onlardan biri Qumda, o biri Rəştdə, digəri isə İsfahanda dəfn olunub. Bakıda dəfn olunan imam övladını fərqləndirmək üçün ona Fatimeyi-suğra (kiçik Fatimə) deyirlər. Həkimə xanımın (s.ə) Bakıya gəlib-çıxmasının səbəbi mənbələrdə müxtəlif cür göstərilib. Bəzi məlumatlara görə, o, Mədinədə hökumətin dözülməz təzyiqlərindən qaçmış, başqa bir məlumata görə qardaşı İmam Rzanı (ə) görmək üçün Xorasan istiqamətində yola düşmüşdür. Rəvayətə görə, Həkimə xatun (s.ə) Xəzər dənizinin cənub sahilindəki Ənzəli limanından Baba Səccad adlı bir nəfərin bələdçiliyi ilə dəniz yolu vasitəsilə Bakıya gəlmiş, burada Əhli-beyt (ə) tərəfdarı Hacı Bədir adlı tacir ona xidmət etməyi öhdəyə almışdır. Hacı Bədir imam qızını təhlükəyə salmamaq üçün Bakı şəhərindən kənara köçmüş və indiki Şıxlar kəndinin ərazisində məskən salmışdır.

“Bibi-Heybət” sözünün birinci hissəsi olan “bibi” ifadə-

si əsasən, fars dilində hörmət mənasında qadına müraciət forması kimi işlədilir. "Heybət" sözünə gəlincə, bəziləri bunu "Hacı" və "Bədir" sözlərinin ilk hərflərinin – "hey" və "bə" səslərinin birləşməsi kimi qəbul edirlər. Guya Hacı Bədir təzə məkanda özünü Heybət adlı nökər, Həkimə xatunu isə öz xanımı kimi təqdim edirmiş. Bir müddətdən sonra Həkimə xatun (s.ə) vəfat edir və onu elə bu yerdə dəfn edirlər. Hacı Bədiri (Heybəti) də öz vəsiyyətinə əsasən, Həkimə xatunun məzarının ayaq tərəfində, bir qədər aşağı müstəvidə torpağa tapşırırlar.

Müqəddəs məzarın yanındakı 3 qəbirin kimlərə aid olması mübahisəlidir. Rəvayətlərdə bu qəbirlərdə İmam Rzanın (ə) nəvələrinin basdırıldığı qeyd edilir. Guya Həkimə xatun (s.ə) bu uşaqları da özü ilə birlikdə gətiribmiş. Hər bir halda, bu 3 nəfər də imamət nəslindən möhtərəm seyyidlər imiş.

Maştağalı şair Kərbəlayi Molla Rza Əli Nazimin (1856-1926) bir növhəsini oxuculara təqdim edirik:

*Mövsümi-əza yetibdir, edərik nəva, Həkimə,*
*Geymişik qəra sərasər, tutmuşuq əza, Həkimə.*

*Bir tərəf susuz Hüseynin ərbəinidir bu əyyam,*
*Bir tərəf Həsən vəfatı qoymayıbdı bizdə aram.*
*Qətli-Müctəbayə Əsma binti-Əş"əs etdi iqdam,*
*Həşrdə Bətulidən bir etmədi həya, Həkimə.*

*Bir tərəf ölüb Peyəmbər, gəlmişik hamı nəvayə,*
*Külli-masiva sərasər ol səbəb batıb qərayə.*

*Şiələr bu sərzəmində yanıva gəlir əzayə,*
*Ucalıbdu ərşə sövti-va Mühəmmədа, Həkimə.*

*Baş açıq, ayaq birəhnə, sinə çak, yanə-yanə,*
*Va müsibəta səsilən şuri salmışıq cəhanə.*
*Göz yaşı üzardə sel tək olub rəvanə,*
*Çün səfər edib bəqayə xətmi-ənbiya, Həkimə.*

*Bu qara ələm, bu icma qəmlərin nikatidir bu,*
*Bu əza, bu qarə, bu yas, şiələr büsatidir bu.*
*Yatma bixəbər, xanım dur, qardaşın vəfatidir bu*
*Ki, Rza ölübdü, başın sağ ola, əya Həkim.*

## Fərd

*Verilər zəhri-cəfa qardaşın Rzayə, xanım,*
*Düşübdür Tusdə bir dərdi-bidəvayə, xanım.*
*Quru yer üstə verib can, qapısı bağlı qalıb,*
*Öləndə həsrət olub xişi-əqrəbayə, xanım.*
*Diyari-Qummdə Məsuməyə, dur, eylə xəbər,*
*Təvəqqüf eyləməyin, tez gedin əzayə, xanım.*

## Nohənin ardı

*Tus içində ol qəribin yoxdu bir ənisü yari,*
*Eylədi şəhid Məmun zəhr ilən o şəhriyari.*
*Hücrələr içində yalqız, olmadı nə qəmküsari,*
*Səslənirdi, bacı, gəl gör. can verir Rza, Həkimə.*

*Çün öləndən sora sərvər dəfn olundu izzət ilən,*
*Tutdular əza o şahə əhli-Tus müddət ilən.*
*Kərbəla qəribi cəddün qaldı nəşi zillət ilən,*
*Qüslü qan, hənuti oldu xaki-Kərbəla, Həkimə.*

## Fərd

*Əgərçi oldu şəhid Tusdə İmam Rza*
*Ki, əhli-Tus ona tutdu izzət ilə əza.*
*Verildi qüslü kəfən, dəfn olundu izzət ilən,*
*Vəlakin qalmadı nəşi yer üstə zillət ilən.*
*Öləndə cəddün Hüseyn dil susuz, cigər ətşan,*
*Nə olmadı onu bir qəbr evinə aparan.*
*Cahanda olmayıb heç kəs onun sayağında*
*Ki, qaldı üç günədək nəşi gün qabağında.*

## Növhənin ardı

*Əlqərəz, başın sağ olsun, güllərin bu gün solubdur,*
*Həm vəfat edib Peyəmbər, hə əmim Həsən ölübdür.*
*Tusdə əzizi-canın zəhr ilə şəhid olubdur,*
*Nazimin olub həmişə zikri va Rza, Həkimə.*

# NARDARANDA RƏHİMƏ XANIM (S.Ə) ZİYARƏTGAHI

Nardaran qəsəbəsi Bakının ən qədim kəndlərindən biridir. Kəndin adının mənası haqqında müxtəlif versiyalar var. Çünki deyilənə görə, bu müqəddəs torpaqda 7-ci İmam Museyi-Kazımın (ə) qızı Rəhimə xanım (s.ə) və xanımın həyat yoldaşı Mir Əbdullah ağa dəfn olunub. Sonradan onların məzarlarının üzərində möhtəşəm ziyarətgah – "Nardaran piri" tikilib.

Nardaran qəsəbəsindəki Nardaran piri, yerli camaatın verdiyi məlumata görə, VIII əsrə aiddir. Bu memarlıq abidəsi özündə bir neçə məscid, məqbərə, başdaşı, sənduqə formalı tarixi mədəniyyət abidələrini cəmləşdirir.

Deyilənə görə, Rəhimə xanım (s.ə) öz ailəsi ilə birgə bu kəndə pənah gətirib. Əsl adı Fatimə olan bu xanım qeyri-adi qabiliyyətə, insanlara şəfavermə bacarığına malik olub. O, yanına gələn xəstələri təkcə öz kəraməti ilə deyil, həm də təbabət elminin və öz əlləri ilə topladığı dərman otlarından hazırladığı məlhəmlərin köməyi ilə sağaldırmış. Həddindən artıq rəhmli və şəfa verən olduğundan, yerli əhali onu Rəhimə xanım adlandırmışdır. Deyilənlərə görə, Rəhimə xanım çox erkən - 20-22 yaşında vəfat edib. Onun dünyadan köçməsi barəsində də müxtəlif ehtimallar var. Bəziləri Rəhimə xanımın ilk övladını dünyaya gətirən zaman, bəziləri isə xəstəlikdən dünyasını dəyişdiyini söyləyirlər.

Hələ Rəhimə xanımın sağlığında bu ocaq müqəddəs tutulmuş, vəfatından sonra isə onun məzarını ziyarətgaha çevrilmişdir. Lakin sonralar Rəhimə xanımın qəbri yerləşən Pir təbiət hadisələri ilə əlaqədar olaraq itib-batıb. Yəni, Xəzər dənizinin XIII-XIV əsrlərdə yerinə çəkilməsi nəticəsində kəndin şimal hissəsində boşluq əmələ gəlib və şimal küləklərinin gətirdiyi qum qəbrin üstünü örtüb. Lakin əsrin əvvəllərində kənd sakini Şeyx Yunisin yuxusundan sonra, onun təşəbbüsü ilə burada qazıntı işləri aparılıb və ziyarətgah bərpa olunub.

Rəvayətə görə, Nardaran sakini Yunis bütün gün həyəcan içərisində gəzib-dolaşırmış. Artıq 3-cü gün imiş ki, hər gecə nur üzlü, mələk simalı qadın onun yuxusuna gəlirmiş. O səsləyirmiş: "Mən İmam övladı, İmam bacısı Rəhimə xanımam (s.ə). Burada torpaq içərisində qalmışam, məni xilas et!" Xanımın səsi onun qulaqlarından getmir. O, yuxusunu kəndin ağsaqqallarına danışır. Onlar yığılıb köhnə qəbristanlıq yerinə gəlirlər. Yunis yuxuda gördüyü yeri göstərir və onlar qazmağa başlayırlar. Hamı qalaqlanan torpağı kənara atdıqca, özlərində qəribə bir rahatlıq, yüngüllük duyurmuşlar. Qazılan torpağın yerində artıq böyük bir çuxur yaranır. Birdən hamı əl saxlayır. Çünki torpağın altından çıxan tikili artıq açıq-aydın görünürmüş. Nardaran ağsaqqalları ziyarətgahın ətrafında dövr edib namaz qılırlar.

Tarix İnstitunun əməkdaşı, tarixçi Dilavər Əzimlinin sözlərinə görə, müqəddəslər haqqında deyilən rəvayət və hədisləri müqəddəs Qurani-Kərimdən gələn ayələr təsdiq edir: "Bu məlumatlar nəsildən-nəsilə ötürülür. Heç bir müqəddəs yer itə bilməz. Ola bilsin ki, müxtəlif səbəblərlə o

yer gözdən itir, yaxud da unudulur. Amma müəyyən bir vaxt keçdikdən sonra bu şəxslər insanların yuxusuna girir. Belə hallar çox olur. Mən şəxsi təcrübəmdə din məsələlərinin tarixi və problemlərinə toxunan zaman bu cür hallarla çox rastlaşdım. Məsələn, Cəlilabad rayonunda belə bir hadisə baş verib. Müqəddəslərimizdən biri uşağın yuxusuna girərək ona bir yeri işarə edib. Uşaq bunu böyüklərinə danışdıqdan sonra həmin yer qazılır və oradan İmam Museyi-Kazımın (ə) qızının qəbri çıxır. Yəni, mən bu məsələnin reallığına inanıram”.

Ölkəmizdəki müqəddəs yerlər haqqında araşdırmalar aparan Məşədixanım Nemət “Azərbaycan pirləri” haqqında yazdığı kitabda qeyd edir ki, rəvayətə görə, Nardaran pirindəki məqbərə və qəbir üzərində kitabə yoxdur, lakin bəzi mənbələrdə imam övladlarının təqib olunarkən bu tərəflərə üz tutmaları haqqında ara-sıra qısa məlumatlara rast gəlmək mümkündür: “Türbə binasını memarlıq quruluşuna görə XII-XIII əsrlərə aid etmək olar. Ona bitişik düzbucaqlı plana malik məscidin qapısı üzərində bütöv bir əhəng daşına iri süls elementli nəsx xətt ilə yazılmış ərəbcə kitabənin tərcüməsi belədir: “Bu mübarək məscidin, Allahın salavatına yetişəcək evin bina olmasına iki müqəddəs məkanın, hacıların seçilmiş, dövrün yeganəsi, böyük sədr Xacə Hacı Həmzə ibn Qutlu Mahmud Şahabadi-Allah onun müvəffəqiyyətini əbədi etsin - 765-ci ildə əmr etmişdir” (1363-1365)”.

Qeyd olunan kompleksdə daha bir maraqlı məscid və abidə var. Ərəbcə kitabənin məzmunu belədir: “Bu məscidin tikilməsinə mömin Şeyx Nurəddin Mahmud ibn Şeyx

Zahid Əbu Yusif, həqiqətən yeddi yüz yeddinci ildə (1307-1308) əmr edib: - Hökmdarlıq Allaha məxsusdur”.

Kitabədə daha iki şeyxin – Nurəddin Mahmud və atası Şeyx Zahid Əbu Yusifin adları çəkilir. Qeyd olunan şeyxlərin elmi və ictimai-siyasi fəaliyyətləri indi “Nardaran piri” adlanan ruhani, sosial-mədəni, həmçinin siyasi mərkəzi ilə sıx bağlı olub.

Məşədixanım Nemətin kitabında qeyd olunur ki, pir kompleksi yaxınlığında daha başqa məscid, karvansara binası, ətrafda böyük qəbristanlıq da mövcuddur. Kompleks yaxınlğında hamam binası da olub. Lakin bu hamam sonradan uçub-dağılıb. (1920-ci illərdə arxeoloq Əzimbəyov “Nardaran asari-ətiqəsi” adlı əsər yazaraq nəşr etdirib). Ərəbcə iki sətirdən ibarət olan kitabənin mətni belədir: “Bu pak və təmiz imarətin tikilməsini sədr əl-möhtərəm Xacə Zeynəddin ibn mərhum Mövlana Şəhabəddin – Allah onu pəhmət eləsin - əmr etdi”.

Sovet hakimiyyəti illərində başqa ziyarətgahlar kimi Nardaran pirinin də sökülməsi gözlənilirdi. Amma Nardaran əhalisi pirin qapısını daşla hörərək bunun qarşısını almış, ancaq gecələr bu daşları söküb pirə daxil olurmuşlar. Hər dəfə bu hadisə təkrarlandığı üçün əhali çıxış yolunu yalana əl atmaqda görür. Kəndin kolxoz və kənd sovetinin sədri pirin möhkəm bünövrəsini əsas tutaraq onun anbar kimi istifadə olunmasını təklif edir. Tədbir baş tutur və Nardaran piri bu yolla xilas edilir. 1951-ci ildə anbara çevrilən tikilidə buğda saxlanılmağa başlanır. Yalnız 1956-cı ildə yerli əhali yığışaraq buranı təmizləyir və pir əvvəlki vəziyyətinə qaytarılır.

Nardaran pirinin müxtəlif yerlərində 3 quyu var. Deyilənə görə, bu quyulardan vaxtilə Rəhimə xanım (s.ə) istifadə edib. Quyulardan biri 17 metr dərinliyə malikdir. Onun çoxşaxəli suyu var. Bəzi insanlar onun Məkkədəki müqəddəs Zəmzəm suyunun dadını verdiyini deyirlər. Pirin həyətində "Ürək daşı" adlandırılan bir ziyarətgah da var.

Nardaran piri 1994-cü ildə yenidən inşa edilib. Pirin maketinin hazırlanması bacarıqlı memar Nemət Əsədulla oğluna həvalə olunub. 1994-cü il avqustun 10-da Peyğəmbərin (s) mövludu günü tikintinin bünövrəsi qoyulub. Köhnə tikili müasir dövrdə də qədim abidə kimi qorunur.

# BİLGƏHDƏ LEYLA XANIM (S.Ə) VƏ PİR HƏSƏNDƏ XƏDİCƏ XANIM (S.Ə) ZİYARƏTGAHLARI

İmam Rzanın (ə) Həkimə xanım (s.ə) və Rəhimə xanımdan (s.ə) başqa iki bacısının da qəbrinin Azərbaycan ərazisində olduğu təsdiqlənmişdir. Onlardan biri Leyla xanımın (s.ə) qəbridir ki, Bilgəh kəndində ziyarətgahdır. Digəri isə Xədicə xanımın (s.ə) qəbridir ki, Pirhəsən ziyarətgahında yerləşir. Hər iki qəbri Azərbaycanın və digər ölkələrin zəvvarları mütəmadi olaraq ziyarət edirlər.

Bilgəh kəndindəki Leyla xanımın (s.ə) qəbri də müqəddəs yerlərdəndir. Bu memarlıq kompleksi böyük bir sahəni əhatə edərək, içi gözəl xalçalarla bəzədilmişdir. Kompleksdə olduqca gözəl işlənmiş çox sayda otaq var. Həmin otaqlarda xanıma məxsus bir çox əşya, həmçinin islamın rəmzləri qorunub saxlanılır. Yerli əhali ziyarətgahı İmam Rza (ə) və din hörmətinə mühafizə edirlər.

Ramazan ayının başlanğıcından sonuna qədər hər gün ayrı-ayrı şəxslər burada iftar süfrəsi verir, insanlar axın-axın gəlib burada halal iftar süfrəsində orucunu açırlar. İftar süfrəsindən öncə Kərbəla və Azərbaycan şəhidlərinin əziz ruhluarına dualar, sonra isə mübarək “Qədr” surəsinin tilavəti, həmçinin Ramazan ayının və iftar süfrəsinin duası oxunur, dəvətlilər iftarlarını açırlar.

Mərdəkandakı Pirhəsən abidə kompleksi İmam Rzanın

(ə) kiçik bacısı Xədicənin (s.ə) şərəfinə tikilmişdir. Burada da günbəz tikilmiş, İslam arxitekturasına uyğun olaraq yer mərmərlə döşənmişdir. Kompleksə məscid, hamam, minarə, günbəz, namaz qılmaq üçün böyük zal, çox sayda daxili otaqlar vardır. Yer yaşıl rəngli kaşı ilə bəzədilməkdən əlavə burada da bir çox İslami simvollar sərgilənmişdir. O cümlədən Xanım Xədicənin (s.ə) türbəsi diqqəti çəkir.

Bu ziyarətgahların hər ikisi bir çox cəhətdən dəyərlidir. Əvvəla dövr baxımından qiymətli məkanlardır. İkincisi, hər biri özlüyündə çox gözəl memarlıq və sənət inciləridir. Bu abidələrin qorunub saxlanılması özü böyük bir tarixin qorunub saxlanılması deməkdir. Bunlar İslam mədəniyyətinin və tarixinin canlı nümunələridir ki, mənsub olduğu dövrün mahiyyətini sərgiləməkdədir. Hətta, Sovet dövründə yerli əhali imamlarımıza olan sevginin və İslam mədəniyyətinin qorunub saxlanması üçün əlindən gələni etmişlər. Bu səbəbdən bu gün həmin abidələr əsrlərin sınağından çıxaraq mövcudluğunu qoruyub saxlayır.

# II FƏSİL

# İMAMƏT SƏMASININ SƏKKİZİNCİ PARLAQ ULDUZU İMAM RZA (ə)

*Ya Rza! Bu qərib canımə lütf et,*
*Ərzəmlə Əlinin hüzuruna get*[15].

14 məsumdan biri olan və İmamət səmasının səkkizinci parlaq ulduzu Əli ibn Musər-Rza (ə) hicrətin 148-ci ilində, Zilqədə ayının 11-də Mədinə şəhərində dünyaya gəlmişdir. Atası İmam Kazım (ə), anası Tüktəm xanım idi.

Əllamə Məclisi "Cilalül-üyun" kitabında İmam Rzanın (ə) tərcümeyi-halı barədə yazır: "O Həzrətin şərif adı Əli, künyəsi Əbül-Həsən və ən məşhur ləqəbi Rzadır. Ona Sabir, Fazil, Rəzi, Vəfi, Qurrətül- eynil-möminin (Möminlərin gözünün işığı) və Qeyzül-Müləhhidin (Dinsizlərə qəzəb eləyən) də deyirmişlər.

Musa ibn Cəfərdən (ə) sonra, övladı Əbül-Həsən Əli ibn Musər-Rza (ə) imamlıq məqamına layiq olmuşdur. O Həzrət digər qardaşlarına nisbətdə daha üstün elmə, səbrə və təqvaya malik idi. Onun ictihadı (ibadətdə çalışqanlığı) isə hamıdan üstün idi. Şiə və əhli-sünnə arasında belə, ali

---

[15] Axund Hacı Soltan

sifətlərin o Həzrətə məxsus olmasında ixtilaf yoxdur. Hamı o Həzrəti bu sifətlərlə tanıyırdı. Onun ilahi rəhbər və imam olmasına başqa bir möhkəm dəlil atası İmam Museyi-Kazımın (ə) buyurduğu hədislərdə özündən sonra imamın kim olmasına dair işarələrdir. İmam Kazım (ə) oğlu Əlidən (ə) başqa digər oğulları barədə imamlıq göstərişi verməmişdir. Belə ki, İmam Kazımın (ə) buyurduğu hədislərin birində oxuyuruq: "İmamət nur və işıqdır, Allahtəalanın "Allaha, onun Peyğəmbərinə və nazil etdiyimiz nura iman gətirin!" (ayəsində) buyurduğu "nur" həmin imamət nurudur".

İmam Rza (ə) hicrətin 203-cü ilində Xorasan vilayətinin Tus şəhərində şəhid olmuşdur. Həmin vaxt İmamın (ə) əlli beş yaşı var idi. İmam Rzanın (ə) atasından sonra imamlıq müddəti iyirmi il olmuşdur.

## İMAMIN (Ə) "RZA" ADLANDIRILMASININ SƏBƏBİ

İmam Rzanın (ə) səhabələrindən biri İmamın oğlu, 9-cu imamımız İmam Cavaddan (ə) sual etdi: "Sizin müxaliflərinizdən bir dəstə belə güman edirlər ki, Bəni-Abbasi xəlifəsi Məmun İmam Rzanı (ə) özünə vəliəhd seçən vaxt "Rza" ləqəbini yüksək məqamlı atanıza verdi, bu doğrudurmu?". İmam Cavad (ə) buyurdu:"And olsun Allaha, onlar yalan deyirlər. Allah-təala onu "Rza" adı ilə adlandırdı. Çünki asimanda Allah yanında bəyənilmiş, Yerdə isə Allah Rəsulu (s) və Əhli-beyt (ə) ondan razı olmuşlar və Allah onu imamətə bəyənmişdir". Sual edən səhabə deyir ki, mən yenidən İmam Cavaddan (ə) soruşdum: "Sənin keçmiş ataların Allah, Peyğəmbər (s) və İmamət (ə) tərəfindən bəyənilmişdimi?" İmam Cavad (ə) buyurdu: "Bəli!" Dedim: "Bəs nə üçün İmam Rza (ə) onların arasından bu ləqəblə tanınmışdır?" İmam Cavad (ə) buyurdu: "Çünki dostları onu sevdikləri kimi, düşmənləri və müxalifləri də onu sevmiş və ondan razı olmuş, həmçinin də bəyənmişlər".

İbn Babəveyh mötəbər sənədə əsaslanaraq, Süleyman İbn Həfsdən nəql edir ki İmam Museyi-Kazım (ə) daim öz sevimli oğlunu "Rza" deyə səsləyər və buyurardı: "Mənim oğlumu "Rza" deyə səsləyin. Mən də onu "Rza" adı ilə səsləmişəm". O, Həzrətə xitab edəndə, onu "Əbül-Həsən" deyə çağırardı.

# İMAMIN ÜZÜYÜ

O Həzrətin (ə) üzüyünün üzərinə “Maşaəllah la qüvvətə illa billah”, başqa rəvayətə əsasən isə, “Həsbiyəllah” yazılmışdır. Bu iki rəvayət bir-birinə zidd deyildir. Ona görə ki, o Həzrətin iki üzüyü vardı. Biri özünün idi, digəri isə atasından ona çatmışdı. Necə ki, Şeyx Kuleyni “Musa ibn Əbdürrəhman”dan nəql edir ki, O, demişdir: Həzrəti-Əbül-Həsəndən (ə) özünün və atasının üzüyünün üzərinə nə yazıldığı haqda soruşdum. İmam (ə) buyurdu: “Mənim üzüyümün üzərinə “Maşaəllah la qüvvətə illa billah”, atamın üzüyünün üzərinə isə “Həsbiyəllah” yazılmışdır. Barmağıma keçirdiyim üzük həmin üzükdür.

# İMAM RZANIN (ə) İMAMƏT MƏQAMINA ÇATMASI

İmam Rza (ə) atası İmam Museyi-Kazımın (ə) şəhadətindən sonra hicri-qəməri 183-cü ildə 35 yaşında İmamət məqamına çatdı. Onun imamət müddəti 20 il çəkdi. İmam Rzanın (ə) yaşayış dövrünü üç hissəyə bölmək olar:

1. İmamətdən qabaqkı dövr – 35 il
2. İmamətdən sonrakı dövr Mədinə şəhərində - 15 il
3. İmamətdən sonrakı dövr Xorasan şəhərində - 5 il

Birinci on ili Harun-ər-Rəşidin xilafəti dövrünə, ondan sonra 5 il Harunun böyük oğlu Məhəmməd Əminin xilafəti dövrünə, axırıncı 5 ili isə Harunun kiçik oğlu Abdullah Məmunun xilafət dövrünə təsadüf etmişdir.

İmam Rza (ə) Harun ər-Rəşidin xilafəti dövründə Mədinə şəhərində yaşadı. İmam (ə) Mədinədə olduğu müddətdə çoxlu şagirdlər yetişdirmişdir.

Bəzi bədxahlar İmamın (ə) bu işlərindən xəbərdar olduqda Bağdada gəlib Harunla görüşüb ona çatdırdılar ki, bəs Musa ibn Cəfərdən sonra oğlu onun yerində oturub imamət iddiası edir. Bu, sizin xilafətiniz üçün qorxuludur. Harun əsəbi halda dedi: “Atası ilə etdiyimiz kifayət deyilmi? İstəyirsiniz qılıncı əlimə götürüb bütün ələviləri məhv edim?”. Harun xəbər gətirənlərə əhəmiyyət vermir. Beləliklə, İmam Rzanın (ə) imamlıq dövrü davam edir. Tarixi sənədlərdə qeyd olunur ki, İbn Qavləveyh (öz sə-

nədi ilə) Davud Riqqidən belə nəql edir: “İmam Kazımdan (ə) soruşdum: “Sizə fəda olum! Artıq yaşlanmışam. Əlimdən tutub, məni oddan xilas edin! Sizdən sonra imam kimdir?” İmam Kazım (ə) oğlu Əbül-Həsən Rzaya (ə) işarə edib belə buyurdu: “Məndən sonrakı sahibiniz (imamınız) budur”.

Əbülqasim Cəfər ibn Mühəmməd başqa bir sənədlə Nüeym Qabusidən İmam Kazımın (ə) belə buyurduğunu nəql edir: “Əli oğullarımın ən böyüyüdür. Aralarından ən çox onu sevirəm. O mənimlə birlikdə “Cəfrə” baxır. Ona (Cəfr kitabına) nəbi və ya vəsidən başqası baxa bilməz”[16].

---

[16] Şeyx Müfid (r.ə), “Əl-İrşad”, cild 2, səh 247-248

# MƏMUNUN İMAM RZAYA (Ə) VƏLİƏHDLİK TƏKLİFİ

*Sədaqətə arxalan, zülmü qoyma yaxına,*
*Kimsəyə bel bağlama, sığın haqq dərgahına.*
***Nizami Gəncəvi (Sirlər xəzinəsi)***

Bəni-Abbas xəlifələrindən olan Məmun İmam Rzanı (ə) Mədinədən Xorasana dəvət etdi, habelə o Həzrətə (ə) xəlifəliyi qəbul etməyi təklif etdi. Tarix bu haqda belə yazır: "Mə`mun: "Ey peyğəmbər oğlu, mən sizi hər cəhətdən xəlifəlik məqamına özümdən daha ləyaqətli görürəm. Buna görə də bu məqamdan iste`fa vermək və bu məqamı sizə tapşırmaq istəyirəm". İmam Rza (ə): "Əgər bu məqam Allah tərəfindən sənə verilmişdir və sənin haqqındırsa, onu başqasına tapşırmaq olmaz və əgər bu məqam sənin deyildirsə, özünün olmayan bir şeyi başqasına necə bağışlaya bilərsən?" Mə`mun: "Hər halda siz bu məqamı qəbul etməlisiniz". İmam Rza (ə): "Mən bu işi görməyəcəyəm və heç zaman sənin istədiyini riza və rəğbətlə qəbul etməyəcəyəm". Mə`mun: "Doğrudanmı istəmirsən?" İmam Rza (ə): "Doğrudan istəmirəm". Mə`mun: "Elə isə mənim vəliəhdliyimi qəbul elə". İmam Rza (ə): "Bu məqamı da qəbul edə bilmərəm". Mə`mun: "Siz bu məqamı qəbul etməyə məcbursunuz. Mən sizi onu qəbul etməyə məcbur edəcəyəm". İmam Rza (ə): "Məni təhdid edirsənmi?" Mə`mun:

"Bəli, təhdid edirəm"[17].

Əgər bu xilafət sənə aiddirsə, Allah onu sənin üçün qərar vermişdir. Belə olan halda, Allahın sənə geyindirdiyi paltarı çıxarıb başqasına verməyin caiz deyildir. Əgər sənə aid deyilsə, yenə də, özünə aid olmayanı başqasına bağışlamağın caiz deyildir".[18]

İstər Bəni-Üməyyə, istərsə də Bəni-Abbasdan olan xilafət qəsbkarları Əhli-beytdən (ə) qorxurdular. Çünki yaxşı bilirdilər ki, xilafət Əhli-beytin (ə) haqqıdır. Peyğəmbərin (s) varisləri olan bu pak ailəyə hər bir fürsətdən istifadə edərək əzab-əziyyət etməkdən çəkinmirdilər… Amma Məmun digər yolu seçdi. O, atasından daha zirək idi. Məmun İmam Rzanı (ə) zindana atmadı, ona zahiri işgəncə və əzab vermədi, onlardan daha ağır əzab verdi. İmam Rzanın (ə) ruhunu sıxıntı və təzyiqdə saxladı. Bu sıxıntı və təzyiqlərin çoxluğu sayəsində İmam Rzanın (ə) məcburi halda vəliəhdliyi qəbul etməsi baş verdi.

İmam Rza (ə) dəfələrlə Məmunun vəliəhdlik təklifindən boyun qaçırdı. İş o yerə çatdı ki, Məmun bərk əsəbiləşərək İmamı (ə) ölümlə hədələdi. İmam Rza (ə) bir neçə səbəbə görə məcbur qalıb vəliəhdliyi qəbul etdi.

Bir rəvayətdə nəql olunmuşdur ki, "İmamdan (ə) hansı məcburiyyətə görə vəliəhdliyi qəbul etdiniz?" deyə soruşduqda buyurdu: "Həmin məcburiyyətə görə ki, babam Həzrəti-Əli (ə) Şurada iştirak etməyə məcbur oldu" (Hə-

---

[17] Doktor M.R.Salehi Kirmani. Ədalətin qurbanları (14 Məsumun həyatları haqqında) Tərc: Ərsəlan Fəsiyhi. İran, Qum şəhəri "Ənsariyan" nəşr. 1992. səh. 293

[18] Nişapuri. "Rovzətul-vaizin". s. 223.

min Şura Ömər İbn Xəttabın göstərişi ilə xəlifəni təyin etməkdən ötrü təşkil edilmişdi).

Başqa bir rəvayətdə İmam Rza (ə) buyurub: "Onun (Məmunun-H.H.) sözlərinə aldanmayın. And olsun Allaha, məni ondan başqası qətlə yetirməz. Amma səbr etməkdən başqa bir çarəm yoxdur ki, ömrümü başa vurum".

İmam Rza (ə) camaatı agah etmək üçün əlinə düşən bütün fürsətlərdən istifadə edirdi. Nişapur əhlinin yanında "Silsilətül-zəhəb" hədisində buyurur: "La ilahə illəllah" mənim qalamdır. Ona daxil olan hər bir kəs mənim əzabımdan amandadır. Əlbəttə, bunun şərtləri vardır və mən də o şərtlərdən biriyəm".

"Silsilətül-zəhəb" kəlməsinin lüğəvi mənası "Qızıl silsilə" deməkdir. Bu hədisin raviləri arasında Peyğəmbərə (s) qədər bütün məsum imamlar olduğu üçün buna "Silsilətül-Zəhəb" hədisi deyirlər.

İmam Rza (ə) Məmunun onun vəliəhdliyindən öz xilafətinin qanuniləşdirilməsi üçün istifadə etməsinə imkan vermədi və Əhli-beytin (ə) vilayətinin haqq olduğunu hər yerdə hamıya bəyan etdi. Məmunun vəliəhdliyi İmam Rzaya (ə) təklif etməsinin və onu məcburi şəkildə İmam Rzanın (ə) boynuna qoymasının mühüm dəlilləri aşağıdakılardan ibarətdir:

1. İmam Rzanın (ə) mənəvi məqamına və üsyançı hesab etdiyi ələvilərə zərər yetirmək;
2. Abbasilərin hökumətini qanuni hökumət kimi qələmə vermək;
3. Əhli-beyt (ə) aşiqi olan və abbasilərə nifrət bəsləyən camaatı cəlb etmək;

4. İmam Rzanın (ə) fəaliyyətini nəzarət altına götürmək;

5. Öz hökumətinin Xorasan əhalisi və bütün iranlılar tərəfindən qanuni hökumət kimi qəbul olunmasına çalışmaq.

İmam hicri-qəmərinin 203-cü ilinin səfər ayının sonunda Nuqanın Sənabad adlı məkanında Abbasi xəlifəsi Məmunun göstərişi ilə zəhərlənib 55 yaşında şəhid edildi. Onun pak və müqəddəs qəbri İranın Məşhəd şəhərindədir.

# İMAM RZANIN (Ə) ƏXLAQ VƏ RƏFTARI

İmamlar (ə) Allah tərəfindən seçilmişdir və Allahın Yer üzündə höccətləridirlər. Onlar xalqa həyat dərsi, paklıq və fəzilət öyrətməklə əhali üçün ülgü və sərməşq idilər… İmamların (ə) yüksək əxlaqi keyfiyyətləri onları hamıdan yüksəyə qaldırdı. İmamlar (ə) heç vaxt özlərini xalqdan ayrı hesab etmir, onları qul olmağa və alçaqlığa çəkmir, heç kəsi təhqir etmirdilər.

İbrahim İbn Abbas deyir: "Heç vaxt görmədim ki, İmam (ə) bir danışan adamın sözünü kəssin. Gecələr az yatar, çox oyaq qalardı. Daim oruc tutardı. Xeyirxah işlərlə məşğul olar, gizli ehsanlar verər, qaranlıq gecədə gizlincə yoxsullara kömək edərdi". Məhəmməd İbn Əbi İbad deyir: "Həzrətin (ə) yerə saldığı fərş yayda həsir, qışda isə palaz idi. Onun ev paltarı qalın və kobud idi. Ancaq ümumi məclislərə gedəndə sadə və yaxşı paltar geyir, özünü düzəldərdi".

Bir gecə İmamın (ə) qonağı gəlmişdi. Söhbət zamanı çıraqda qüsur əmələ gəldi və qonaq istədi çırağı düzəltsin. İmam (ə) razı olmayıb çırağı özü qaydaya saldı və buyurdu: "Biz elə bir nəsilik ki, qonağı işlətmərik".

Bir şəxs İmama (ə) söylədi ki, and olsun Allaha, Yer üzündə heç kəs şərafətdə sizin atalarınızdan yüksək deyil. İmam (ə) buyurdu: "Atalarımızı şərafətləndirən paklıq və Allaha itaətdir ki, onları böyük edib".

Bəlx əhalisindən bir kişi deyir: “Xorasan səfərində İmam Rza (ə) ilə yoldaş idim. Bir gün süfrə açmışdı. İmam (ə) bütün xidmətçiləri, qulamları, hətta qaraları da süfrədə oturtdu ki, onunla birlikdə çörək yesinlər. Mən ona söylədim ki, sənə qurban, yaxşı olar ki, onlar ayrı otursunlar. İmam (ə) buyurdu: “Hamının Allahı, ata-anası birdir. Hər kəsin mükafatı isə onun əməlindən asılıdır”.

Bir qərib İmamın (ə) xidmətinə gəlib dedi: “Mən sizin ata-babalarınızın dostlarındanam. Həccdən qayıdıram. Pulum qurtarıb. Yol xərcim yoxdur ki, gedib evə çatım. Mənə bir az borc verin, evimə çatım. Ora çatan kimi borcumu sizin tərəfinizdən yoxsullara sədəqə verərəm. Mən öz şəhərimdə yoxsul deyiləm. Amma səfərdə belə möhtac qalmışam”. İmam 200 dinar gətirib qapının arasından əlini uzatdı və yolçunu səslədi: “Bu iki yüz dinarı götür, yol xərci et, mənim tərəfimdən bu pulu sədəqə verməyin lazım deyil”. O şəxs dinarları alıb getdi. İmam (ə) geri dönəndə ondan soruşdular ki, niyə belə etdiniz ki, o pulu alanda sizi görməsin? İmam (ə) cavab verdi: “Elə etdim ki, o xəcalət çəkməsin”.

İmamın (ə) dostlarından Süleyman Cəfəri deyir ki, bəzi məsələlərdən ötrü İmamın hüzuruna getmişdim. İşim qurtardı və istədim ki, azad olum. İmam (ə) mənə bu gecəni onun yanında qalmağı buyurdu. İmamla (ə) birlikdə onun evinə getdik. Axşam çağı idi. Həzrətin (ə) qulamları bənnalıq edirdilər. İmam (ə) onların içində kənar adam görüb, kimliyini soruşdu. Dedilər: “Bizə kömək edir, haqqını verəcəyik”. İmam (ə) soruşdu: “Muzdunu təyin edibsinizmi?” Dedilər, xeyir, nə versək razı olar. İmam (ə) narazılıqla buyurdu: “Bunlara tapşırmışam ki, heç kəsin haqqını da-

nışmamış işə çağırmayın. Gələn adamla danışın, qərardad bağlayın, alacağınızı və verəcəyinizi bilin. Muzdu danışılmış işin haqqından cüzi artıq verilsə, muzdlu razı qalar. Yox əgər danışılmayıbsa, əməlin üç bərabəri haqq versən, yenə xəyal edəcək ki, azdır".

Göründüyü kimi, bizim məsum İmamlarımız (ə) həmişə öz tərəfdarlarını haqqı, ədaləti qorumağa səsləmişlər.

İmam Rzanın (ə) böyük səhabələrindən olan Əhməd ibn Məhəmməd ibn Nəsr Bəzənti üç nəfər yaxın adamı ilə onun xidmətinə gəlir və bir saat oturduqdan sonra getmək istəyir. İmam (ə) üzünü Əhmədə tutub deyir: "Sən əyləş". Gecədən xeyli keçənə qədər söhbət edirlər. Sonra Əhməd yenə mürəxxəs olmaq istəyir. Amma İmamın təklifindən sonra qalır. İmam Rza (ə) öz otağına keçib geri dönəndə Əhməd sevincindən səcdəyə düşüb deyir: "Allah, sənə çox şükür olsun ki, Allahın höccəti neçə nəfər xidmətinə gəldiklərimizin içində mənə bu qədər hörmət və ehtiram etdi". Əhməd səcdədən qalxan kimi İmam (ə) onun əlini sıxıb, buyurur: "Ey Əhməd! Əmirəl-möminin öz yaxın əsabələrindən Səsəə ibn Suhanın görüşünə gəlir və getmək istəyərkən deyir ki, ey Səsəə, sənin görüşünə gəldiyim üçün qardaşların önündə fəxr etmə, özünü onlardan üstün tutma. Allahdan qorx, pəhrizkar və pak ol! Allah üçün təvazökar və şükür edən ol! Allah sənə ucalıq bəxş edər".

İmam Rza (ə) bunu söyləməklə xəbərdarlıq edir ki, dünyada heç bir iş insanın özünü tərbiyə etməyə və nəfsini düzəltməyə tay ola bilməz. Hətta İmama (ə) yaxın olmaq, onun lütf və mərhəmətiylə fəxr edib öyünməklə də, özünü başqalarından üstün tutmaq olmaz.

# İMAM RZANIN (ə) "QƏRİB" ADLANDIRILMASININ SƏBƏBİ

İmam Rzaya (ə) fərqli bir münasibətin yaranmasında onun qeyri-ərəb torpağı olan Məşhəddə dəfn edilməsidir. Belə ki, bu fakt İmam Rzaya (ə) bir "qərib", bir "qonaq" olaraq yanaşmağa yol açmış, faciəli həyatının Yaxın və Orta Şərq xalqları arasında "müsibət dastanı"na çevrilməsini şərtləndirmişdir. Məhəmməd Əmaninin aşağıdakı şeiri bu din böyüyünün "qərib" və "qonaq" obrazlarından alınmış poetik təəssüratın parlaq təzahürü olaraq ortaya çıxmışdır:

*Zayiründür övliyavü ətqiya,*
*Höccəti-samin, Əli-Musər-Riza.*
*Göz dikibdir qapına şahü gəda,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Rövzeyi-pakın ki, bar rəşki-cinan,*
*Hər rivaqidür məlayik-aşiyan.*
*Zahirü batin sana irür əyan,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*İnsü cin şeydavü bitabın sənin,*
*Cənnət əhli cümlə əhbabın sənin.*
*Aminü zamindür əlqabın sənin,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Çün şəfi'ül-müznibinsən, ya İmam,*
*Bu səadət bizgə bəs yövmül-qiyam.*
*Bar adın virdi-məlayik sübhü şam,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Ey zərihin qibleyi-hacat olan,*
*Nitqinin tutisiğə mirat olan.*
*Ehtisami-üzri-təqsirat olan,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Gülşənindir hurü qılman gül dərən,*
*Gülbədindür ğünçə hər gün nur verən.*
*Tövfin edənlərğə hər dəm feyz irən*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Rözvənə ruhül-əmin fərraşlıq,*
*Etsə,tan irməs ki, bar sirdaşlıq.*
*Mehr edər görgəc yüzün xəffaşlıq,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Qütbi-afaq oldu hər bir xadimin,*
*Bazgəştidür qapun hər nadimin.*
*Ərzi-hal irdi ğərəz iradimin,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Bar məlayik birlə bihədi-bəşər,*
*Həmsəbəq hafizlərin şamü səhər.*
*İzlərinin tozi mazağğül-bəşər,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Hər səhər müğlər yilər əlhanidin,*
*Əhli-dərdin dideyi-giryanidin.*
*Axsa əşki, yol tapar dərmanidin,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Qətreyi-əşkin edən dürdanələr,*
*Oldilər şəm'in görüb pərvanələr.*
*Can verürlər rəşkdin fərzanələr,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Talibani-elm hər tədrisdə,*
*Əksəri dərsi oxub təhsisdə.*
*Cəm olurlar məclisi-təqdisdə,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Həbbəza carübkəşlər müttəsil,*
*Eyləmişlər səhnidin xüldü xəcil.*
*Varidindin zayil olur rəngi-dil,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

*Bar Əmani şərmsarü rusiyah,*
*Əfvi-təqsirati üçün üzrxah.*
*Eyləmiş lütfün bedərgahi-ilah,*
*Höccəti-samin, Əli-Musər-Riza.*

## SALAM OLSUN ALİ-"YASİN"Ə

"Uyunu-Əxbarir-Riza" kitabında yazılmışdır: "Bəni-Abbas xəlifəsi Məmunun əmri ilə bütün alimlər İmam Rzanın (ə) hüzuruna cəm oldular. İmam (ə) onlardan soruşdu: "Qurani-Kərimdə "Yasin" kəlməsində kim nəzərdə tutulub?" Bəni-Abbas alimləri dedilər: "Yasin"dən məqsəd Mühəmməddir (s)". İmam (ə) buyurdu: "Allah-təala İslam Peyğəmbərinə (s) bir üstünlük vermişdir ki, onu ağlı və düşüncəsi olmayanlar başa düşə bilməzlər. O üstünlük belədir. Allah-təala Qurani-Kərimdə Peyğəmbərlərdən (ə) başqa heç kəsi salamlamayıb. Belə ki, "Saffat" surəsinin 79-cu ayəsində "Salam olsun Nuh Peyğəmbərə (ə) bütün aləmlərdə", 109-cu ayədə "Salam olsun İbrahimə (ə), 120-ci ayədə "Salam olsun Musaya (ə) və Haruna (ə), 130-cu ayədə "Salam olsun "Ali-Yasin"ə, 182 ci ayədə "Salam olsun bütün Rəsullara".

Allah-təala "Salam olsun "Ali-Yasin"ə buyurarkən "Yasin" övladlarını nəzərdə tutur. Bir halda ki, "Yasin" Peyğəmbərə (s) dəlalət edir, deməli "Ali-Yasin"də Əhli-beytə (ə) dəlalət edir.

# III FƏSİL

# İMAM RZANIN (ə) MÜXTƏLİF DİN VƏ MƏZHƏB ALİMLƏRİ İLƏ ELMİ MÜBAHİSƏLƏRİ

*Zülmə əyilməyən başı nizədə gəzdirər fələk,*
*Əyalını əsir edib, qətara düzdürər fələk.*

***Axund Azər Sani***

Tarixi mənbələrdə İmam Rzanın (ə) müxtəlif din və məzhəb alimləri ilə elmi mübahisələri barədə bir sıra hədislər gəlmişdir. İmamın (ə) hikmətli cavabları bir daha onun elminin Allah tərəfindən verilmiş "lədünni" elm olduğunu sübut edir.

Şeyx Səduq Həsən ibn Məhəmməd Nofəli Haşimidən belə rəvayət edir: "İmam Rza (ə) Məmun ilə görüşdükdən sonra Məmun, Fəzl ibn Səhlə əmr etdi ki, xiristianların rəisi Casiliqi, yəhudilərin başçısı Rəsul-Çalutu, sabei (Nuh (ə) dinində olduqlarını güman edənlərin) başçılarını, atəşpərəstlərin və zərdüştilərin rəisi böyük Hərbəzi, həmçinin Nəstas Rumini və mütəkəllimləri bir yerə toplasın və İmam Rzanın (ə) onlarla mübahisəsini müşahidə etsinlər. Fəzl ibn Səhl onları bir yerə yığıb Məmuna xəbər verdi. Məmun dedi: "Mərhəba, mən sizi xeyr iş üçün çağırmışam

və istəyirəm ki, siz Mədinədən gələn əmioğlum ilə mübahisə edəsiniz. Səhər tezdən burada hazır olun, bir nəfər də bu əmrdən boyun qaçırmasın”. Onlar dedilər: “Ey əmirəl-möminin, eşitdik və itaət edirik. Sabah İnşallah, sübh tezdən hazır olacağıq”. Həsən ibn Məhəmməd Nofəli deyir: Biz İmam Rzanın (ə) yanında idik. Əmirin göndərdiyi Yasir adlı bir şəxs içəri daxil olub dedi: “Ey Seyyidim və ağam, əmirəl-möminin sizə salam göndərib deyir ki, qardaşın sənə qurban olsun, ziyalılar, o cümlədən bütün dinlərdən olan alimlər mənim yanıma toplaşmışlar. Əgər onlar ilə bəhs etməyə meyliniz olsa, sabah sübh tezdən mənim yanıma gəlin. Əgər istəməsəniz, özünüzə əziyət verməyin, istəyirsinizsə biz sizin yanınıza gələk. Bu bizim üçün asandır. Həzrət (ə) buyurdu: “Məmuna deyin ki, mən sənin məqsədini bilirəm, İnşallah, sabah özüm gələrəm”.

Ravi deyir: Yasir gedəndən sonra Həzrət (ə) üzünü mənə tutub buyurdu: “Ey Nofəli, sən iraqlısan. İraqlı rəhmsiz olmaz. Sənin fikrincə, əmim oğlunun müşrikləri və elmi mübahisə tərəfdarlarını toplamaqda məqsədi nədir? Mən dedim: “Sənə fəda olum, sizi imtahan etmək, nə dərəcədə elmli olduğunuzu bilmək istəyir. Lakin möhkəm olmayan bir şeyə əsaslanır. And olsun Allaha, pis qəsd edibdir”. Həzrət (ə) buyurdu: “İndi onun məqsədi nədir?” Mən dedim: “Kəlamçılar və mübahisə tərəfdarları alimlərin əksinədirlər. Çünki inkar olunmayan şeyi alim inkar etməz. Mütəkəllimlər, müşriklər və mübahisəçilər həqiqəti inkar edənlərdir. Əgər Sən onlarla Allahın birliyi barəsində danışsan, deyəcəklər ki, Allahın birliyini isbat et. Əgər desən

Məhəmməd (s) Allahın Rəsuludur, deyəcəklər ki, onun peyğəmbər olmasını isbat et. Bir şəxs onların sözünü dəlillərlə batil edərsə, o şəxsə qarşı öz sözündən əl çəkənə qədər müğalitə (çaşdırıcı sözlərdən istifadə) edərlər. Sənə fəda olum, buna görə onlarla mübahisə etmə. Həzrət (ə) gülümsəyib buyurdu: "Ey Nofəli! Mənim dəlil gətirməkdən aciz qalacağımdan qorxursan?" Nofəli dedi: "Xeyr, and olsun Allaha, mən belə bir güman etmərəm, ümidvaram ki, inşaəllah Allah sizə zəfər verəcəkdir, onlara qələbə çalacaqsınız". Həzrət (ə) buyurdu: "Ey Nofəli, Məmunun tutduğu əməlindən nə zaman peşman olacağını bilmək istəyirsənmi?" "Bəli" deyə cavab verdim". Buyurdu: "Məmun mənim yəhudilərə Tövratdan, xristianlara İncildən, Zəbur əhlinə Zəburdan, sabeilərə ibrani dilində, atəşpərəstlərə onların fars dilində və ruslara rus dilində, mübahisə tərəfdarlarına öz dillərində onları rədd etmək üçün dəlil gətirdiyimi, habelə bütün siniflərin dillərini bağlayıb dəlillərini batil etdiyimi, onların öz sözlərini geri götürdüklərini və mənim sözlərimi təsdiq etdiklərini görəndə, peşman olacaqdır. Məmun o zaman getdiyi məkana layiq olmadığını başa düşüb peşman olacaqdır".

Səhər açıldı, Fəzl ibn Səhl gəlib Həzrətə (ə) ərz etdi ki, sənə fəda olum, əmin oğlu səni gözləyir, camaat da toplaşmışdır. Siz gəlirsinizmi?" Həzrət (ə) buyurdu: "Sən qabaqda gedərsən, mən inşaəllah sonra gələrəm. Həzrət (ə) namaz üçün dəstəmaz alıb şərbət içdi və ondan bizə də içirtdi. Həzrətlə (ə) birlikdə gəlib Məmunun təşkil etdiyi məclisə daxil olduq. Məclis camaatla dolu idi. Məhəmməd ibn

Cəfər Talibiyyinlə Bəni-Haşim arasında oturmuşdu. Ordu əmirləri də məclisdə iştirak edirdilər. İmam Rza (ə) məclisə daxil olanda Məmun və Məhəmməd ibn Cəfər, habelə haşimilər də ayağa qalxdılar. Həzrəti-Rza (ə) Məmun ilə birlikdə oturdu. Hamı ayaq üstə durmuşdu. Oturmaq əmri veriləndən sonra oturdular. Məmun üzünü o cənaba çevirib onunla bir saata yaxın söhbət edəndən sonra üzünü xristian alimi Casiliqə tutub dedi: “Ey Casiliq, bu mənim əmioğlum Əli ibn Musa ibn Cəfərdir. O, bizim Peyğəmbərimizin (s) qızı Fatimə (s.ə) və Əli ibn Əbu Talibin (ə) övladlarındandır. Mən istəyirəm ki, onunla elmi mübahisə edib dəlil gətirəsən və ona qarşı insafla rəftar edəsən. Casiliq dedi: “Ya əmirəl-möminin, mənim inkar etdiyim kitabdan və Peyğəmbərliyinə iman gətirmədiyim Peyğəmbərlərdən mənə dəlil gətirən adamla necə mübahisə edim?” Həzrət (ə) buyurdu: “Ey xristian, əgər sənin üçün İncildən dəlil gətirsəm, onu təsdiq edərsənmi?” Casiliq dedi: “Mənim İncildə yazılanları inkar etməyə qüdrətim çatarmı? Bəli, and olsun Allaha, mənim əleyhimə olsa belə, onu etiraf edərəm”. Həzrət (ə) buyurdu: İstədiyin sualı soruş, cavabını al”. Casiliq: “İsanın (ə) peyğəmbərliyi və onun kitabı haqqında nə deyirsən?” deyə soruşdu. İmam Rza (ə) buyurdu: “Mən İsanın (ə) peyğəmbərliyini, onun kitabını ki, öz ümmətinə xəbər verib və onun köməkçilərinin təsdiq etdiyi bəşarətini təsdiq edirəm. Məhəmmədin (s) peyğəmbərliyini və kitabını iqrar etməyən və ümmətinə bunu müjdə verməyən heç bir insanın peyğəmbərliyini qəbul etmirəm”. Casiliq dedi: “Hökm iki adil şahidin şə-

hadəti ilə yəqinləşdirilmirmi?" Həzrət (ə) buyurdu: "Bəli, belədir". Dedi: "Xristianların yanında şəhadəti qəbul olan və sənin dinindən olmayan iki adil şahid gətir ki, Məhəmmədin (s) peyğəmbərliyini qəbul etsin və bu kimi məsələni bizim ümmətimizdən olmayanlardan soruş". Həzrət (ə) buyurdu: "İndi insafa gəldin. Sən Məsih (İsa) ibn Məryəmə yaxın olan adil şəxsi qəbul etmirsənmi"? Casiliq dedi: "O adil kimdir? Adını mənə deyin". İmam Rza (ə): "Yuhənna Deyləmi haqqında nə deyirsən?" Dedi: "Bəh-bəh, sən Həzrəti-Məsihin (ə) ən çox sevdiyi adamın adını çəkdin". İmam (ə) buyurdu: "Səni and verirəm Allaha, məgər İncildə Yuhənnanın belə deməsi yazılmışdır: "Həzrəti-Məsih mənə ərəb mənşəli Məhəmməd barəsində xəbər verib özündən sonra Məhəmmədin (s) peyğəmbər olacağına müjdə verdi. Mən də bunu həvarilərə xəbər verdim. Onlar Məhəmmədə (s) iman gətirib onu qəbul etdilər". Casiliq dedi: "Yuhənna bu mətləbi Məsihdən (ə) nəql edərək belə bir şəxsin peyğəmbərliyini, ailəsi və canişini barəsində xəbər vermişdir, amma, bunun nə zaman olacağını və onların adlarını müəyyən etməmişdir ki, biz onları tanıya bilək". Həzrət (ə) buyurdu: "Əgər mən bir şəxsi çağırsam və İncili oxuyaraq Həzrəti-Məhəmmədi (s), onun Əhli-beytini (ə) və ümmətini qeyd etsə, iman gətirərsənmi?" Ərz etdi: "Bu həqiqətə uyğun bir sözdür". Həzrət (ə) üzünü Nəstas Rumiyə çevirib buyurdu: "İncilin üçüncü sifrini əzbər bilirsənmi?" Ərz etdi: "Bəli, onu yaxşı əzbərləmişəm". Həzrət (ə) üzünü Rəsul-Caluta tutub dedi: "İncil oxuyursanmı?" Dedi: "Bəli, öz canıma and olsun ki, onu oxuyuram". Bu-

yurdu: “Onda onun üçüncü sifrinə qulaq as. Əgər Həzrəti-Məhəmmədin (s) və onun Əhli-beytinin (ə) və ümmətinin adı çəkilsə mənim üçün şəhadət ver, çəkilməsə şəhadət vermə”. Sonra Həzrət (ə) İncilin 3-cü sifrini Peyğəmbərin adı çəkilən ayəyə qədər oxuyub dayandı və buyurdu: “Ey xristian, Məsih və anasının haqqına, səndən soruşuram, indi bildin ki, mən İncili bilirəm? Dedi: “Bəli”. Sonra Həzrəti-Məhəmmədin (s) ailəsinin, Əhli-beytinin (ə) və ümmətinin adını oxudu və buyurdu: “Ey xristian, nə deyirsən? Bu Məsih (ə) buyurduğudur. İncilin sözlərini təkzib etsən, İsanı (ə) və Musanı (ə) inkar etmiş olursan. Hər zaman bunları təkzib etsən, qətlin vacib olur. Çünki Allahına, Peyğəmbərinə və kitabına qarşı kafir olursan. Casiliq: “Bir şeyin İncildə olduğu mənim üçün aydın olsa, mən onu inkar etməyib təsdiq edirəm” deyə cavab verdi. Həzrət (ə) buyurdu: “Onun iqrarına şahid olun. Sonra əlavə etdi: “Ey Casiliq, istədiyin sualı soruş! Casiliq: “Mənə İsa (ə) həvarilərinin neçə nəfər olmasını və İncil alimlərinin kimliyindən xəbər ver” dedi. Həzrət (ə) buyurdu: “İşin həqiqətini bildin. Həvarilər 12 nəfər idilər. Onların fəzilətlisi və alimi Luğa idi. Amma İncil alimləri 3 nəfər idi. Əcdə yaşayan böyük Yuhənna, Qirqisiyada yaşayan Yuhənna və Zucarda olan Yuhənna Deyləmi, onlar Peyğəmbərin (s), Əhli-beytinin (ə), habelə onun ümmətinin sifətlərini bilirdilər. O, bir kəs idi ki, İsa (ə) ümmətini və Bəni-İsraili o Həzrətə (ə) xəbər vermişdi. Sonra Həzrət (ə) buyurdu: “Ey xristian, and olsun Allaha, mən Həzrəti-Məhəmmədə (s) iman gətirən İsanı (ə) təsdiq və qəbul edirəm. İsada nama-

zının, orucluğunun azlığından və onun zəifliyindən başqa xoşa gəlməz bir şey tapmadım”. Casiliq dedi: “Allaha and olsun, öz elmini zay etdin, işini korladın. Mən səni islam alimlərindən biri bilirdim”. Həzrət (ə) “Nə oldu?” deyə soruşdu. Casiliq dedi: “Sizin dediyinizə görə İsa (ə) zəif imiş və az namaz qılıb, az oruc tutardı. Halbuki İsa (ə) yemək yediyi gün və yatdığı axşam olmamışdır. O, həmişə gündüzlər oruc tutar, gecələri isə namaz qılıb ibadətlə məşğul olardı”. Həzrət (ə): “(Əgər İsa Allah idisə), Kimin üçün namaz qılıb, oruc tutardı?” deyə soruşdu. Həzrətin (ə) sualından sonra Casiliqin dili tutulub sözü kəsildi. Həzrət (ə) buyurdu: “Ey xristian, səndən bir məsələni soruşmaq istəyirəm”. Ərz etdi: “Soruşun, bilsəm, cavab verərəm”. Buyurdu: “Allahın izni ilə İsanın (ə) xəstələrə şəfa verməyini nə üçün inkar edirsiniz?” Casiliq dedi: “Mən bunu ona görə inkar edirəm ki, hər kəs anadan gəlmə koru, dəri xəstəsini sağaltsa və ölünü diriltsə, o, Allahdır və ibadətə layiqdir”. Həzrət (ə) buyurdu: “Əlyəsə peyğəmbər də İsa (ə) kimi ölünü dirildir, anadan gəlmə koru sağaldır, su üzərində gəzir və dəri xəstəsini sağaldırdı. Ümmətindən bir nəfər də olsun onu Allah adlandırmayıb ona pərəstiş etməyibdir. İsa (ə) gördüyü işlərdən Hezqil peyğəmbər də etmişdir. Məsələn 35 ildə 60 min ölünü diriltmişdir. Üzünü Rəsul-Caluta tutub dedi: “Ey Rəsul-Calut, Tövratda bu 35 min nəfər Bəni-İsrail cavanlarından olduqlarını görmüsən? Buxtunəssər bunları Bəni-İsrail əsirlərindən ayırdı. Beytul-müqəddəsdə muharibə edib onları Babil şəhərinə apardığı zaman Hezqil (ə) onları diriltdi. Bu, Tövratda vardır.

Bunu sizlərdən olan kafirlərdən başqa heç kəs inkar etməz”. Rəsul Calut dedi: “Biz bunu eşitmiş və bilmişik. İmam (ə): “Düz deyirsən” deyə buyurdu. Sonra əlavə etdi: “Ey Yəhudi, qulaq as, mən Tövratdan bir neçə ayə oxuyum. O Cənab Tövrat ayələrini oxumağa başladı. Yəhudi üzünü Həzrətə (ə) çevirmişdi və Həzrətin Tövrat ayələrini oxumağına çox təəccüb edirdi. Sonra Həzrət (ə) üzünü xristiana, yəni Casiliqə tutub buyurdu: “Deyərsənmi, bu 35min nəfər İsadan (ə) öncə olmuşlar, yoxsa İsa (ə) onlardan qabaq olmuşdur?” Ərz etdi: “Onlar İsadan (ə) qabaq olmuşlar”. Həzrət (ə) buyurdu: “Qüreyş tayfası Həzrəti-Məhəmmədin (s) yanına gedib xahiş etdilər ki, onların ölülərini diriltsin. O Həzrət (s) üzünü Əli ibn Əbu Talibə (ə) tutub buyurdu: “Qəbristana get və onların istədiyi tayfanı uca səslə çağırıb de: “Ey filan kəslər, Allahın Rəsulu Məhəmməd buyurur ki, Allahın izni ilə oyanın”. Həzrəti-Əli (ə) Peyğəmbərin dediyi kimi etdi. Ölülər başlarından torpaq tökə-tökə ayağa qalxdılar. Qüreyş tayfası üzlərini onlara tutub onlardan vəziyyətlərini soruşdular. Sonra Həzrəti-Məhəmmədə (s) peyğəmbərlik verilməsini onlara xəbər verdilər. Onlar: “Biz də onu dərk etmək istəyirdik və O Həzrətə (ə) iman gətirərdik” dedilər. Sonra İmam Rza (ə) buyurdu: “Bizim Peyğəmbərimiz (s) anadangəlmə koru, dəri və dəlilik xəstəliyinə tutulanları sağaltdı. Heyvanlar, cinlər, quşlar və şeytanlar onunla danışırdılar, amma biz onu Allah bilmədik. Biz heç bir peyğəmbərin fəzilətini inkar etmirik, amma onları Allah da bilmirik. Siz İsanı (ə) Allah bilirsinizsə nəyə görə Əlyəsə və Hezqil

peyğəmbərləri Allah bilmirsiniz? Halbuki o iki nəfər də İsa (ə) kimi idilər; ölünü dirildirdilər və s. Bəni-İsrail bəziləri taun xəstəliyinin və ölümün qoxusundan öz şəhərlərindən qaçdılar. Alah-təala onların hamsını bir saatın içində həlak etdi. Bunların həlak olduqları kəndin camaatı onların ətrafını divarla tutdular. Onların sümükləri ovulub çürüyənə qədər bu vəziyyət davam etdi. Bir gün Bəni-İsrail peyğəmbərlərindən biri oradan keçərkən onların çürümüş sümüklərini görüb təəccüb etdi. Allah tərəfindən həmin Peyğəmbərə (ə) belə vəhy oldu: "Onlara baxmaq istəyirsənsə, onları dirildim". Ərz etdi: "Bəli, Allahım, istəyirəm". Vəhy gəldi: "Onları uca səslə çağır". Peyğəmbər (ə) dedi: "Ey çürümüş sümüklər, Allahın izni ilə qalxın. Birdən onlar başlarından torpaq tökə-tökə ayağa durdular. Həqiqətən, İbrahim Xəlil (ə) dörd quşu tikə-tikə edib hər bir hissəni bir dağın başına qoyduqdan sonra onları səslədi. Birdən heyvanlar dirilib Həzrətin yanına gəldilər. Musa ibn İmran (ə) camaat içindən seçdiyi 70 nəfər səhabəsi ilə birlikdə öz qəbiləsindən dağa tərəf getdi. Onlar Musaya (ə) dedilər: "Sən Allahı görmüsən. Onu gördüyün kimi bizə də göstər". Musa (ə) buyurdu: "Mən Allahı görməmişəm". Onlar dedilər: "Əgər Allahı aydın şəkildə bizə göstərməsən biz sənə iman gətirməyəcəyik. Sonra ildırım onları vurdu və hamılıqla yandılar. Təkcə Musa (ə) qaldı. Ərz etdi: "İlahi, mən 70 nəfər Bəni-İsraildən seçib onlarla gəldim, indi tənha qayıdıb bu xəbəri öz qəbiləmə desəm məni necə təsdiq edərlər". Allah-təala onların hamısını öləndən sonra diriltdi. Ey Casiliq, bunların hamısını sənin

üçün bəyan etdim. Bunların heç birini rədd etməyə qüdrətin çatmır. Ona görə ki, bunlar Tövratda, İncildə, Zəburda və Quranda gəlmişdir. Belə ki, hər kəs ölünü diriltsə, anadangəlmə korun gözlərini açsa, dəri xəstəliklərini və dəliləri sağaltsa, Allah yox, əksinə bunlar ibadətə layiqdirlər. Bunların hamısını özün üçün Allah hesab et. Bu barədə nə deyirsən? Casiliq ərz etdi: "Söz sənin sözündür" (yəni düz deyirsən). (Allahdan başqa bir tanrı yoxdur.) Sonra Həzrət üzünü Rəsul-Caluta tutub buyurdu: "Ey yəhudi, mənə bax, səni Musa İbn İmrana (ə) nazil olan on möcüzəyə and verirəm, sən Tövratda Məhəmmədin (s), ailəsi və ümməti barəsində bir xəbər görmüsənmi? Orada yazılmışdır ki, hər zaman dəvəyə minmiş adama itaət edən axirəz-zaman ümməti gəlsə, onlar Allaha təzə ibadətxanalarda ciddiyyətlə, yeni təsbihlərlə zikr edəcəklər. Yəni onların zikrləri keçmiş ümmətin etdiyi zikirlərdən deyildir. Bəni-İsrail onlara və onların başçılarına pənah aparmalıdırlar ki, qəlbləri adam olsun. Həqiqətən, yer üzündə öz yolunu azmış ümmətlərdən intiqam alan qılınclar onların əlindədir". Ey yəhudi, bu, Tövratda vardırmı?" "Bəli, biz belə görmüşük" deyə Rəsul Calut cavab verdi. Ondan sonra Casiliqə buyurdu: "Ey xrisitan, Şəyanın kitabı ilə tanışlığın vardırmı-?" Dedi: "Onu hərf-hərf bilirəm". Həzrət (ə) Casiliqlə Rəsul-Caluta buyurdu: "Siz bilirsiniz ki, bu, onun sözlərindəndir: "Ey qəbilə, mən ulağa minən bir şəxsin üzünü gördüm, paltarı elə bir nurdan idi və dəvəyə minəni də gördüm, ay kimi işıq saçırdı". Dedilər: "Tamamilə doğrudur. Şəyanın kitabında belə yazılmışdır". İmam Rza (ə) buyur-

du: "Ey xristian, İsa (ə) İncildə belə deməmişdirmi ki: "Mən sizin Allahınızın və öz Allahımın yanına gedəcəyəm. Barqalita, yəni Məhəmməd (s) gələcək və mənə haqq ilə şəhadət verəcək, necə ki, mən ona şəhadət verirəm. Hər bir şeyi sizin üçün bəyan edən odur, ümmətlərin eyblərini və rüsvayçılıqlarını zahir edən odur, küfrün sütununu qıran odur". Casiliq dedi: "İncildən iqrar etdiklərimizdən başqa bir şey demədin. Həzrət (ə): "Bu, İncildə vardırmı?" deyə soruşdu. Dedi: "Bəli". Həzrət (ə) buyurdu: "Mənə əvvəlki İncilin itməsindən və onun kimin yanında tapılmasından və kimin onu sizə verməsindən heç danışmırsan?" Casiliq dedi: "Biz İncili bir gündən artıq itirməmişik, onu itirdikdən sonra təzə halda tapdıq. Onu Yuhənna və Mətta bizim üçün çıxartdılar". Həzrəti-Rza (ə) buyurdu: "Sənin İncil və İncil alimləri haqqında məlumatın nə qədər də azdır. Sənin güman etdiyin kimidirsə, nəyə görə İncildə ixtilaflı məsələlər yarandı, halbuki ixtilaf sizin əlinizdə olan İncildə yaranmışdır. Həqiqətən, əgər əhdi (əvvəlki) İncil qalsaydı və o sizin əlinizə gəlib çatsaydı, heç bir ixtilaflı məsələ olmazdı. Mən bunları sənə öyrədərəm: "Bilməlisən ki, əvvəlki İncil itəndən sonra xristianlar öz alimlərinin yanına toplaşıb dedilər: "İsa ibn Məryəm öldürüldü, biz də İncili itirmişik, siz bizim alimlərimizsiniz, sizin əlinizdə nə vardır?" Əluqa və Mərqabus dedilər: "İncil bizim sinəmizdədir. Biz onu sifr-sifr sinəmizdən hər kimin haqqında olsa belə çıxardacağıq. Siz isə ona görə qəmlənməyin. Beləliklə, İncili sizə sifr-sifr kimin barəsində nazil olmuşsa tilavət edəcəyik və bununla da onu toplayacağıq. Əluqa,

Mərqabus, Yuhənna və Mətta həmin əvvəlki İncil itəndən sonra sizin üçün İncili düzəltdilər. Bu dörd nəfər böyük alimlər idilər. Bunları bildinmi?" Casiliq ərz etdi: "Mən bu söhbətdən qabaq bu məsələləri bilmirdim. İndi onları öyrəndim və mənə məlum oldu ki, sən İncili nə qədər bilirsən. Sizdən bir neçə şey eşitdim ki, ürəyim onun həqiqətinə şəhadət verir. Bu barədə çox danışmağınızı istəyirəm". Həzrət (ə) buyurdu: "Onların şəhadəti sənin fikrincə necədir?" Ərz etdi: "Caizdir (mümkündür), onlar İncil alimləridir verdikləri şəhadətdə haqqdır". Həzrət (ə) Məmuna, məclisdə olan qohumlarına və başqalarına xitab edərək dedi: "Şahid olun". "Şahidik" deyə dilləndilər. Həzrət (ə) Casiliqə buyurdu: "Sizi and verirəm övlad və ananın (yəni İsa (ə) və onun anasının) haqqına, bilirsinizmi ki, Mətta belə demişdir: "İsa Davud ibn İbrahim ibn İshaq ibn Yəqub ibn Yəhud ibn Həzrunun oğludur. Mərqəbus isə İsa (ə) nəsəbi haqqında belə demişdir: "Məryəmin oğlu İsa (ə) Allah kəlməsidir ki, insan bədəninə keçib insan oldu" Əlviqa dedi: "İsa və anası ətdən və qandan olan iki insandırlar. Sonra Ruhul-Qudus onlara daxil olmuşdur". Ey Casiliq, sən İsanın (ə) öz haqqında verdiyi şəhadətinin doğru olduğuna inanırsanmı? İsa (ə) belə demişdir: "Ey həvarilər, sizə deyirəm, həqiqətən, yalnız asimandan nazil olan şəxs asimana qalxa bilər. Bundan başqa, yalnız dəvəyə minmiş peyğəmbərlərin sonuncusu Həzrəti-Məhəmməd (s) bunu edə bilər. Həqiqətən, o asimana gedib geri qayıdacaqdır". Bu barədə nə deyirsiniz?" Casiliq dedi: "Bu İsanın sözləridir, biz bunu inkar etmirik". Həzrət

buyurdu: "Onda Əlvuqanın, Mərqabusun və Məttanın İsa (ə) haqqında verdikləri şəhadətə və onun haqqında danışdıqlarına sözün nədir?" Casiliq dedi: "Onlar İsa (ə) haqqında yalan danışıblar". Həzrət (ə) buyurdu: "Ey camaat, Casiliq bu alimləri pak adlandırmadı? Onların İncil alimləri olmasını və sözlərinin haqq olmasını iddia etmədi?" Casiliq dedi: "Ey müsəlmanların alimi, bu alimlərin işlərinə görə məni bağışlamağını istəyirəm". Həzrət (ə) buyurdu: "Ey xristian, səni bağışladım, hər hansı məsələni istəsən soruşa bilərsən". Dedi: "Məndən başqası sual etsin. And olsun Həzrəti-Məsihə (ə), güman etmirəm müsəlman alimlərinin içərisində sənin kimisi olsun". Sonra İmam (ə) üzünü Rəsul-Caluta tutub buyurdu: "Sən mənə sual verirsən, yoxsa mən sənə sual verim?" O dedi: "Mən səndən sual soruşmaq istəyirəm. Amma sənin Tövratdan, İncildən və Davudun Zəburundan olmayan heç bir dəlil və sübutunu qəbul etmərəm. Yaxud İbrahimə (ə) və Musaya (ə) nazil olan səhifələrdən olmalıdır". Həzrət (ə) buyurdu: "Məndən Musa ibn İmranın (ə) dilində olan Tövratdan, İsa ibn Məryəmin (ə) dilində olan İncildən və Davudun (ə) dilində olan Zəburdan başqa dəlilləri qəbul etmə". Rəsul Calut dedi: "Hansı dəlilə əsaslanaraq Məhəmmədin peyğəmbərliyini sübut edirsən?" İmam Rza (ə) buyurdu: "Onun Peyğəmbər olmasını Musa ibn İmran, İsa ibn Məryəm və Allahın yer üzündə xəlifəsi olan Davud (ə) şəhadət veriblər". Ərz etdi: "Musa ibn İmranın şəhadətini sübut et". Həzrət (ə) buyurdu: "Ey yəhudi, bilirsizmi ki, Musa (ə) Bəni-İsrailə: "Tezliklə sizin üçün öz qardaşlarmızdan olan

bir peyğəmbər gələcəkdir. Onun sözlərini eşidib özünü təsdiq edin" deyə vəsiyyət etmişdir. Bəni-İsrail üçün İsmayıl övladlarından başqa qardaş tanıyırsan? Yəqubla İsmayıl arasında olan qohumluğu və onların arasında İbrahim (ə) tərəfindən olan səbəb və yaxınlığı bilməlisən". Rəsul Calut dedi: "Bəli, bu Musanın dedikləridir və biz onu rədd etmirik". Həzrət (ə) dedi: "Məhəmməddən (s) başqa Bəni-İsrailə qardaş olan bir peyğəmbər vardırmı?" dedi: "Xeyr". Həzrət: "Bu, sizin fikirinizcə düzgün deyildir?" deyə soruşdu. Ərz etdi: "Bəli, doğrudur, lakin istəyirəm ki, Məhəmmədin (s) peyğəmbərliyini Tövratdan isbat edəsən". Həzrət (ə) buyurdu: "Məgər bu cümlə Tövratda yoxdurmu? Yəni, Sina dağından bir nur gəlib Sair dağından bizim üçün işıq saçdı və Faran dağında bizim üçün aşkar oldu". Rəsul Calut dedi: "Bu kəlmələri bilirəm, amma təfsirini bilmirəm". Həzrət (ə) buyurdu: "Mən sənə deyirəm. Turi-Sinadan nurun gəlməsini deyəndə Allah-təaladan Musaya (ə) gələn haqq olan vəhy nəzərdə tutulur. Amma Sair dağının işıqlanmasında məqsəd Allahın İsa ibn Məryəmə (ə) o dağın başında olarkən vəhy göndərməsidir. "Faran dağında bizə aşkar oldu" dedikdə isə Məkkə dağlarından olan və Məkkə ilə arasında bir günlük yolu olan dağdır. Sənin və səhabələrinin dediyinə görə, Tövratda Şəya peyğəmbər belə demişdir: "Mən iki nəfəri – birini ulağa, o birini isə dəvəyə minmiş halda gördüm. Onlar üçün yer işıqlanmışdı. Bəs o ulağa və dəvəyə minənlər kimlərdir?" Rəsul Calut dedi: "Mən onların kim olduqlarını bilmirəm. Mənə onlar haqqında məlumat verin". Həzrət (ə)

buyurdu: “Ulağa minən Həzrəti-İsa (ə), dəvəyə minən isə Məhəmməd (s) olmuşdur. Bunun Tövratdan olmasını inkar edirsənmi?” “Xeyr, inkar etmirəm” deyə o, cavab verdi. Həzrət (ə): “Heyquq peyğəmbəri tanıyırsanmı?”deyə soruşdu. Dedi: “Bəli, tanıyıram”. Həzrət (ə) buyurdu: “Sizin kitabınızda da yazılmışdır ki, Allah Faran dağından bəyan gətirdi. Bununla da göylər Əhməd (s) və ümmətinin təsbihi ilə doldu. Beytül-müqəddəsin xarab olmasından sonra bizə təzə kitab gətirəcəkdirmi? Təzə kitab dedikdə, Quran nəzərdə tutulur. Bunu təsdiq edirsənmi?” Ərz etdi: “Heyquq peyğəmbər bunları demişdir, biz də onu inkar etmirik”. Həzrət (ə) buyurdu: “Davud (ə) bunları demişdir, sən də onu oxuyursan: “Pərvərdigara, peyğəmbərliyə fitrət zamanından sonra (yəni peyğəmbərlik aradan gedəndən və din köhnələndən sonra) sünnəti bərpa edən şəxsi seç. Məhəmməd (s) peyğəmbərdən başqa fitrətdən sonra sünnəti bərpa edən peyğəmbər tanıyırsanmı?” Rəsul Calut dedi: “Bu, Davudun (ə) sözləridir. Biz bunu bilirik və inkar etmirik, amma burada İsa (ə) nəzərdə tutulur. Onun zamanı fitrət idi”. Həzrəti-Rza (ə) buyurdu: “Bilmirsən, İsa (ə) Allah onu göyə aparana qədər sünnətin müxalifi deyildi, əksinə Tövratın sünnəti ilə müvafiq idi. İncildə yazılmışdır: “İbn Birrə gedəcək, Barqilitə gələcəkdir. O, sizin yüklərinizi yüngülləşdirəcəkdir, hər şeyi təfsir edəcək və mənim barəmdə mən onun barəsində verdiyim kimi nişanələr göstərəcəkdir. Mən sizin üçün məsəlləri gətirdim, o isə təvilləri (batini sirlər) gətirəcəkdir. Bunları təsdiq edirsənmi?” “Bəli, onu inkar etmirəm” deyə cavab verdi. Sonra Həzrə-

ti-Rza (ə) dedi: "Rəsul-Calut, səndən öz peyğəmbərin Musa ibn İmranın (ə) barəsində soruşummu?" Ərz etdi: "Soruşun". Buyurdu: "Musanın (ə) peyğəmbər olmasını sübut etmək üçün nə dəlilin vardır?" O dedi: "Mənim dəlilim odur ki, Musa (ə) öz peyğəmbərliyini sübut etmək üçün özündən qabaqkı peyğəmbərlərin heç birinin etmədikləri möcüzələri etdi". "Nə möcüzə etdi?" deyə Həzrət (ə) soruşdu. Ərz etdi: "Dənizi yarmaq, əsanı əjdahaya çevirmək və onu daşa vurmaqla çeşmə çıxartmaq, əlilə işıq saçmaq, yaranışların aciz olduqları işləri görmək kimi möcüzələr etdi". Həzrət buyurdu: "Düzdür, düzdür, gətirdiyin dəlil və sübut onun yaranışların aciz olduqları işləri etməsidirsə, peyğəmbər olmasını iddia edən, sonra isə kimsənin qüdrəti çatmayan işləri görən şəxsi sizin təsdiq etməniz vacibdir, belə deyilmi?" Dedi: "Xeyr, ona görə ki, Musanın Allah yanında malik olduğu məqam və yaxınlığın misli yoxdur. Əgər Musa kimi möcüzə gətirməsə, bizə bir kəsin peyğəmbərliyini təsdiq etmək vacib deyildir". Həzrət buyurdu: "Bəs Musadan (ə) qabaqkı peyğəmbərləri nəyə görə təsdiq edirsən? Halbuki onlar nə dəryanı yardılar, nə əsanı daşa vurub onun kimi çeşmə çıxartdılar, nə də əsanı hərəkət edən əjdahaya çevirdilər". O yəhudi dedi: "Mən dedim ki, əgər bir şəxs öz peyğəmbərliyini sübut etmək üçün yaranmışların gətirə bilmədiyi möcüzəni gətirsə, istər Musa gətirdiyi möcüzə olsun, istərsə də ondan başqa, onları təsdiq etmək vacibdir". Həzrət buyurdu: "Ey Rəsul Calut, İsanın (ə) peyğəmbər olmasını təsdiq etməyinə nə mane olur? Halbuki o anadangəlmə koru sağaltdı, ölüləri dirilt-

di, dəri xəstəliyini sağaltdı, torpaqdan quş düzəldərək ona ruh verdi və Allahın icazəsi ilə onu uçurtdu". O dedi: "Deyirlər, belə işlər görüb, amma biz onları müşahidə etməmişik". Həzrət (ə) buyurdu: "Güman edirsən ki, Musanın (ə) gətirdiyi möcüzələri müşahidə etmisən? Məgər sənə Musanı (ə) etibarlı səhabələri onun belə möcüzələr etdiklərini xəbər verməmişlər?" Ərz etdi: "Bəli". Həzrət (ə) buyurdu: "İsa ibn Məryəmdən (ə) də onun kimi çoxsaylı rəvayətlər çatmışdır ki, o da müxtəlif möcüzələri edibmiş. Siz İsanı qəbul etmədiyiniz təqdirdə necə Musanın (ə) peyğəmbərliyini qəbul edirsiniz?" Rəsul Calut cavab verə bilmədi. Həzrət buyurdu: "Məhəmmədin (s) möcüzə etməsi də elə bu cürdür". Məhəmmədin (s) işi və gətirdiyi möcüzələri, həmçinin Allahın göndərdiyi bütün peyğəmbərlərin işi belədir. Həzrəti-Məhəmmədin (s) möcüzəli işindən biri də onun yetim, çoban, muzda işləyən, kitab oxumamış, eləcə də bir şey öyrənmək üçün heç bir müəllim yanına getməmiş bir şəxs olmasıdır. Keçmiş peyğəmbərlərin hekayətləri və bir-bir xəbərləri, həmçinin içində keçmişdəkilər və qiyamət gününə qədər gələcəkdəkilərin barəsində xəbərləri olan Quranı gətirdi və o Həzrət (s) camaatın gizlin sirlərindən, eləcə də evlərində etdikləri bütün əməllərdən onlara xəbər verdi. O, saysız-hesabsız möcüzə göstərdi". Rəsul Calut dedi: "İsanın və Məhəmmədin xəbərinin bizim üçün həqiqəti yoxdur. Bu iki nəfər haqqında bizə məlum olmayan xəbəri isə təsdiq etmək caiz deyil". Həzrət (ə) buyurdu: "Belə isə İsa (ə) və Məhəmmədin (s) peyğəmbər olmasına şəhadət verənlər, yəni o peyğəmbərlər ki, onların adı-

nı çəkib təsdiq etmişlər yalan danışmışlar”. O yəhudi yenə də cavab tapa bilmədi. Sonra Həzrət (ə) atəşpərəstlərin böyüyü böyük Hərbəzi yanına çağırıb buyurdu: “Mənə peyğəmbərliyini güman etdiyin Zərdüşt barəsində danış. Onun peyğəmbərliyinə nə dəlilin vardır?” Ərz etdi: “O, özündən öncə heç kəsin göstərmədiyi möcüzəni göstərdi. Biz o möcüzələri müşahidə etməsək də, bunu bizdən qabaqkılar bizə xəbər vermişlər. Belə ki, o, belə bir şeyi bizim üçün halal etmişdir ki, ondan başqaları halal etməyiblər. Biz də ona tabe olmuşuq”. Həzrət (ə) buyurdu: “Demək bu xəbərlər sizin üçün gəlmiş və əlinizə çatmış olduğu üçün peyğəmbərinizin dediklərinə itaət edirsiniz?” Dedi: “Bəli”. Buyurdu: “Sair keçmiş ümmətlərin əməllərində Musanın (ə), İsanın (ə), Məhəmmədin (s) və başqa peyğəmbərlərin peyğəmbər olmaları haqda da xəbərlər çatmışdır. Onların peyğəmbərliyini qəbul etməməkdə üzürünüz nədir? Halbuki Zərdüştü qəbul etməyiniz xəbərlərin çox olması əsasındadır ki, o, başqalarının edə bilmədiklərini etdi”. Hərbəzin həmin yerdə sözü kəsildi, daha heç nə demədi.

İmam Rza (ə) buyurdu: “Ey camaat, əgər sizin aranızda İslam dini ilə müxalif olanınız varsa və sual etmək istəsə utanmadan sual versin”. İmran İbn Sabi ayağa qalxdı. O, mütəkəllimlərdən biri idi. Dedi: “Ey camaatın alimi, əgər özünüz sual verməyə dəvət etməsəydiniz, mən sizə sual verməzdim. Mən Kufəyə, Bəsrəyə, Şama və Cəzirəyə (Əlcəzairə) getmişəm və mütəkəllimlərlə mübahisə etmişəm, amma indiyə qədər mənə vəhdaniyyətdə qaim olan və

özündən başqa biri olmayan vahidi (Allahı) sübut edən bir kəsə rast gəlməmişəm”. Həzrət buyurdu: “Əgər bu camaatın arasında İmran Sabi varsa, o da sənsən. Dedi: “Bəli, İmran mənəm”. Həzrət (ə) dedi: “Ey İmran, soruş, lakin insaf et və süst, batil və azğın sözlərdən çəkin”. Dedi: “Ey Seyyidim və sərvərim! And olsun Allaha, mənim yapışıb etmədiyim məsələləri mənim üçün isbat etməyindən başqa məqsədim yoxdur”. Həzrət (ə) buyurdu: “Özün üçün məlum olanlardan soruş”. Bu zaman camaat izdiham yaratdılar. Belə ki, bəziləri digərlərinə yapışdılar. İmran dedi: “Mənə birinci kaindən (Allahdan) və Onun yaratdıqlarından danış”. Həzrət (ə) buyurdu: “Sual etdin, indi isə cavabına diqqət et”. Həzrət onun cavabını aydın surətdə verdi. O, ikinci sualını da verdi. Həzrət o suala da cavab verdi. Beləliklə, mühabisə çox uzun çəkdi. Onu yazmaq kitabın həcminə sığmaz.

Namaz vaxtı oldu. Həzrət (ə) üzünü Məmuna tutub buyurdu ki, namaz vaxtı çatmışdır. İmran ərz etdi: “Ey mənim mövlam, mənim məsələmi kəsməyin, mənim qəlbim incəlib. Yəni, mətləbin məlum olmasına, müsəlman olmağıma az qalıb”. Həzrət buyurdu: “Namaz qıldıqdan sonra qayıdacağam”.

Sonra Həzrətlə (ə) Məmun yerindən qalxdılar. O Həzrət (ə) evə daxil olub namaz qıldı. Camaat isə çöldə Məhəmməd ibn Cəfərin arxasında namaz qıldılar. Sonra Həzrət (ə) və Məmun bayıra çıxdılar. Həzrət (ə) öz yerinə qayıdıb İmranı çağırtdıraraq buyurdu: “Soruş, ey İmran!” İmran sual etdi, Həzrət (ə) də cavabını verdi. Beləliklə, o dalbadal məsələ soruşur, Həzrət (ə) isə suallara cavab verirdi. Həzrətin

(ə) buyurduğu doğru cavablar sayəsində İmran şəhadət verib üzü qibləyə səcdəyə getdi və İslam dinini qəbul etdi.

Ravi Həsən İbn Məhəmməd Nofəli deyir: "Mütəkəllimlər İmran Sabinin dediklərinə qulaq asdılar. Halbuki o, qalmaqal salmağı xoşlayan bir şəxs idi. Heç vaxt bir şəxs onun dəlil və sübutunu sona çatdıra bilməmişdi. Bu vəziyyəti gördükdə daha Həzrətdən (ə) bir söz soruşmadılar. Axşam oldu. İmam Rza (ə) və Məmun ayağa qalxıb evə daxil oldular. Camaat da dağılışdı. Mən bir dəstə səhabələrlə birlikdə idim ki, Məhəmməd ibn Cəfər bir nəfəri göndərib məni yanına çağırdı. Mən onun yanına getdim. O dedi: "Ey Nofəli, dostunun mübahisəsini gördünmü? And olsun Allaha, güman etmirəm Əli ibn Musa (ə) bu gün bəyan etdiyi məsələləri əvvəllər də bəyan etmiş ola. Bunu da deyim ki, indiyə qədər İmam Rzanın (ə) yanına bu qədər mütəkəllim toplaşmamışdı". Dedim: "Hacılar İmam Rzanın (ə) yanına gəlib halal və haram hökmlərini ondan soruşurdular. O Həzrət (ə) də onların cavabını verirdi. O Həzrətin (ə) yanına gəlib onunla mübahisə edənlər də az deyildi. Məhəmməd ibn Cəfər dedi: "Ey Əbu Məhəmməd! Mən qorxuram ki, Məmun o Həzrətə (ə) həsəd edib onu zəhərləsin və yaxud başına bir bəla gətirsin. Sən ona de ki, özünü bu cür səhabələrdən qoruyub belə sözlər danışmasın". Dedi: "Mən ona demişəm, lakin bunu məndən qəbul etmir. O kişinin (Məmunun) bu işdə məqsədi onu imtahan etmək və ata-babalarının elmlərinin onda olduğunu öyrənməkdir". Dedi: "Həzrətə (ə) de ki, əmin sənin bu yola getməyinə razı deyildir. O, özünü neçə cəhətə görə belə işlər-

dən uzaqlaşdırmağını istəyir".

Ravi deyir: "İmam Rza (ə) evinə getdikdə əmisi Məhəmməd ibn Cəfərin dediklərini o Həzrətə (ə) xəbər verdim. Həzrət (ə) təbəssüm edib buyurdu: "Allah əmimi saxlasın, bilirəm niyə bu söhbətlərdən xoşu gəlmir!" Sonra buyurdu: "Ey Qulam, İmran Sabinin yanına gedib onu mənim yanıma gətir". Dedim: "Sənə fəda olum, mən onun bizim şiə qardaşlarımızın hansının yanında qaldığını bilirəm, ancaq yol uzaqdır". Dedi: "Qorxusu yoxdur, minik aparıb onu gətirin".

Mən gedib onu gətirdim. Həzrət (ə) ona xoş gəldin dedi. Libas istəyib ona xələt bağışladı. Bir də ona minik və 10 min dirhəm pul verdi. Dedim: "Sənə fəda olum, babanız Əmirəl-möminin Əli (ə) gördüyü işi siz də gördünüz". Buyurdu: "Biz belə istəyirik". Sonra əmr etdi ki, şam gətirsinlər. Məni sağ tərəfində, İmranı isə sol tərəfində oturtdu. Yeməyi yeyib qurtardıqdan sonra İmrana buyurdu: "Get, Allah sənə kömək olsun. Sübh çağı bizim yanımıza gələrsən, sənə Mədinə yeməyi verəcəyik".

Bundan sonra daim mübahisə sevən mütəkəllimlər İmranın ətrafına toplaşıb onunla mübahisə edirdilər. O da onların fikirlərini batil edirdi. Beləliklə, artıq ondan çəkinir və uzaqlaşırdılar. Məmun İmrana 10 min dirhəm, Fəzlə isə bir miqdar mal və bir at bağışladı. İmam Rza (ə) onu Bəlxdə olan vəqflərə başçı təyin edib, ona çoxlu hədiyyələr bağışladı.[19]

---

[19] Şeyx Səduq Babaveyh. "Uyunu Əxbar əl-Rza (ə)". İmam Rzadan nəql olunmuş hədislər toplusu. Bakı-2014, fəsil 12, səh. 137, 152

## İMAMIN (Ə) EYNİ MƏSƏLƏ BARƏDƏ İKİ HÖKMÜ

Bir yerdən hərəkət edən iki müsafir öz namazlarını necəliyindən sual verərkən, İmam Rza (ə) onlara iki müxtəlif cavab verdi. İmam Rza (ə) onlardan birinə buyurdu: “Sənin namazın şikəstdir”. O birisinə buyurdu: “Sənin namazın tamdır”. Sonra İmam Rza (ə) “Sənin namazın tamdır” deyərək buyurduğu şəxsə məsələni belə izah etdi: “Çünki sən xəlifəni (zalım xəlifə Məmunu) görmək məqsədi ilə gəlmisən. Buna görə də sənin səfərin günah səfəridir və günah olan səfər namazın şikəst olmasına səbəb olmur”. Buradan görünür ki, İmam Rza (ə) hətta şər’i məsələləri bəyan edərək, xalqı zalım padşahdan uzaqlaşdırırdı.

İmam Rza (ə) təkcə şəri məsələlərdə deyil, həmçinin fəzilətli ayların dəyərləndirilməsində də ibrətamiz kəlamlar söyləmişdir. Bildiyimiz kimi, İslam dinində ayinlərin icrasında istifadə olunan 354 gündən ibarət olan hicri-qəməri təqviminin 7, 8, 9-cu ayları (Rəcəb, Şəban, Raməzan) bərəkətli aylar hesab olunur. Peyğəmbər (s) buyurmuşdur: “Rəcəb imamət ayı (Allahın vilayət ayı), Şəban mənim ayım, Ramazan isə Allahın ayıdır”. Şaban ayının qalan son günlərində bu sözü çoxlu təkrar et: “İlahi, Şaban ayının keçmiş günlərində bizi bağışlamamısansa, onun qalan günlərində bizi bağışla.” Həqiqətən, Allah-təala bu ayda Ramazan ayının hörmətinə görə, çoxlu insanları cəhənnəm

odundan azad edir”.[20]

İmam Rzanın (ə) sadiq səhabəsi olan Əba Səlt belə deyir: “Şəban ayının son cümə günündə İmam Rzanın (ə) yanına daxil oldum. İmam Rza (ə) belə buyurdu: “Ey Əba Səlt, artıq şəban ayının çoxu gedib və bu şəban ayının son cüməsidir. Ona görə də şəbanın keçmiş günlərində etdiyin səhlənkarlığı bu ayın qalan günlərində aradan qaldırmağa çalış. Sənə faydası olan işə tərəf üz tut, sənə faydası olmayan işdən uzaqlaş”[21].

Ramazan ayının nə üçün bir ay müddətində olması barədə İmamdan (ə) sual etdilər. İmam Rza (ə) belə buyurdu: “Əgər soruşulsa ki, niyə Raməzan ayının orucu bundan az və ya çox vacib edilməyib, belə cavab verilər: “Çünki bu, zəif və güclünün qüvvətinin çatdığı bir miqdardır”.

[20] Şeyx Səduq. Uyuni-əxbari-Rza. c.1, səh. 51.
[21] Yenə orada.

# İMAM RZA (Ə) VƏ AHU

Nəyə görə İmam Rzaya (ə) "Ya zamini-ahu" (Ahuya kəfil olan, zamin duran) deyirlər? Bu İranda çox məşhur olan bir rəvayətdir. Belə ki, İmam Rza (ə) bir gün bir ahu ovçusu görür. Ovçu bir ahunu nişan alıb vurmaq istədiyi zaman İmam Rza (ə) ilə ahu kimsənin anlamayacağı bir dildə danışmağa başlayır. Ahu İmamdan bunu istəyirmiş ki: "Ona de ki, mənə icazə versin, gedim anama xəbər verim və qayıdım. İstədiyini ondan sonra edər".

İmam Rza (ə) bu halı ovçuya bildirir. İmamı tanımayan ovçu gülərək İmama deyir ki: "Ahunu buraxsan, geri qayıtmaz. İmam (ə) cavabında: "Mən onun geri qayıdacağına kəfiləm, əgər geri qayıtmasa məni əsir götürə bilərsən". Ovçu bu təklifi qəbul edir və İmamı (ə) əsir olaraq yanında saxlayır. Lakin çox qısa bir müddət keçməmiş ahu anasıyla geri qayıtdıqda, ovçu təəccübündən donub qalır və İmama (ə) üz tutub: "Sən kimsən ey ağam?" deyə soruşaraq o Həzrətin kim olduğunu öyrənir. İmam Rzanı (ə) tanıyan kimi, Onun hörmətinə ahunu sərbəst buraxır. Bu barədə müasir dövrümüzün şairlərindən olan, AYB-nin Xəzər bölməsinin sədri Arif Buzovnalının "Zamini-ahu"ya həsr etdiyi "Ahu" rədifli qəzəlinə diqqət yetirək:

*Vüsal eşqilə düşmüşdür vətəndən dərbədər, ahu,*
*Duyub yar ətrini, çöllər gəzər axşam-səhər, ahu.*

*Sudan su inciməz damcı düşəndə damcı üstündən,*
*Məvəddət məşqin etməkçün gələr dünyaya hər ahu.*

*Elə zənn etmə göz dikmiş yerə, boynubükük durmuş,*
*Gözündən düşməyən bir kölgədən çəkməz nəzər, ahu.*

*Xumar gözlər ləbaləb qan, nəfəs təng, durmadan qaçmış,*
*O səhradan bu səhraya yetirməkçün xəbər, ahu.*

*Vəfa zəhrilə qan paylar vücuda səcdədə aşiq,*
*Baş insan, əl-ayaq insan, ürək insan, cigər ahu.*

*Cahanda, ey məhəbbət nemətindən bixəbər insan,*
*Sənin, zikrində, aciz qaldığın sözlə mələr ahu.*

*Vəfadan iz qoyar kim, diz qoyar torpağə izzətçün,*
*Nə əksiklik gələr insana, olsa bir qədər ahu?*

*Sədaqət qəddini əymiş, təəccüb etmə məhşərdə,*
*Əlif tək qəddi dik, hu məhzərində dursa gər ahu.*

*Behiştdən bir nişan olmaz məgər bu, eşq dəştində*
*Tuta bir bəxtəvər insan əlin bir bəxtəvər ahu?*

*Əgər eşqin dili bir gün zəmanət versə dünyaya,*
*Gəzər aslanlar içrə qorxusuz, görməz xətər, ahu.*

*Əgər qəm udduğun olmuşsa da, sus, dinmə, ey insan,*
*Udar dilsiz-ağızsız hər qəmi səndən betər, ahu.*

*Bədəndə çırpınıb, ruh inciyər cismin günahından,*
*Nə cür ki, hər sədadan titrəyər, hürkər, əsər ahu.*

*Zəiflik yox, zəriflik imtəhanından alıb əla,*
*Bəşər meydanına girmiş ki, göstərsin hünər, ahu.*

*Sözün, Arif, deyil Bəhrül-ülumi şe'ri tək şirin,*
*Onun şəhdilə şe'rün səmtinə eylər güzər, ahu.*

# ŞEYX BƏHAİ İMAM RZANIN (Ə) HƏRƏMİNİN DARVAZASINA NƏ YAZMAQ İSTƏYİRDİ

Şeyx hicrətin 953-cü ilinin zilhiccə ayının 17-də (miladi 1546-1622) Livanın Bələbək şəhərinin yaxınlığındakı Cəbə kəndində dünyaya göz açmışdır. İmam Əlinın (ə) ən yaxın əshabından olan Haris Həmədani Şeyx Bəhainin ulu babası olmuşdur.

Şeyx Bəhai İmam Rzanın (ə) hərəminin layihəsini çəkdikdən sonra iş başlanır. Şeyx bütün işlərə və tikinti mərhələlərinə özü nəzarət edir. Hərəmin tikintisi başa çatmazdan qabaq o mühüm bir səfərə çıxmalı olur.

Şeyx memarlara və inşaat məs'ullarına lazımı tapşırıqlarını verir və deyir ki, işi dayandırmayın və hərəmin tikintisini başa çatdırın. Ancaq hərəmin əsas darvazasının (bu həyətin qapısı yox, hərəmin içinə və müqəddəs zərihə açılan qapıdır) baş hissəsi ilə işiniz olmasın.

Şeyxin səfəri uzun çəkir. O səfərdən qayıdanda görür ki, hərəmin tikintisi başa çatıb, əsas darvazanın baş hissəsi də tamamlanıb, camaat bu qapıdan hərəmə get-gəl edir. Şeyx onun tapşırığına əməl edilmədiyinə görə çox narahat olur, onu gözləmədiklərinə görə memarlara etiraz edir. İnşaat məsulu deyir: “Biz sizi gözləmək istəyirdik, amma hərəmin qəyyumu bizim yanımıza gəlib çox təkid etdi ki, hərəmin tikintisini tez başa çatdıraq. Ona dedik ki, Şeyx

bizə tapşırmışdır ki, darvazanın baş hissəsinin tikintisi özümün nəzarətimlə olmalıdır. Ancaq hərəmin qəyyumu qəbul etmədi. Bizim bu işi etmək istəmədiyimizi gördükdə dedi: “Bunun tamamlanmasına göstəriş verən şəxs Şeyxdən böyükdür”. Amma biz yenə də işləmədik. Belə olduqda hərəmin qəyyumu dedi: “Əli ibn Musər-Rza (ə) bu işin tamamlanmasına göstəriş vermişdir”.

Şeyx Bəhai inşaat məsulları və memarlarla birlikdə hərəmin qəyyumunun yanına gedir. Ondan bu məsələyə izah verməsini istəyir. Hərəmin qəyyumu deyir: “Neçə gün ardıcıl olaraq Həzrəti-İmam Rza (ə) yuxuma gəldi və buyurdu: “Şeyx Bəhainin kitabəsi mənim evimin qapısına yerləşdirilməsin. Bizim evimiz heç vaxt heç kimin üzünə bağlı olmayıb. Hər kəs istəsə, gələ bilər”.

Şeyx bu sözləri eşidəndə gözlərindən yaş axmağa başlayır. O, “Ya səttarəl-uyub” (ey eybləri örtən) zikrini vird edə-edə zərihə tərəf gedir. Sonra zərihin yanında o qədər ağlayır ki, huşdan gedir. Şeyx özünə gəldikdən sonra deyir: “Mən bir tilsimi kitabə şəklində əsas darvazanın baş hissəsinə yerləşdirmək istəyirdim. Bu tilsimin təsirindən ziyarətə hazır olmayan adamlar hərəmə daxil ola bilməyəcəkdi. Ancaq Həzrət bunu qəbul etməyib və hərəmin qəyyumunun yuxusuna gələrək bu işə razı olmadığını buyurub”.

Bəli, bizim imamlarımızın qapısı təkcə şiələrə deyil, hətta qeyri-müsəlmanların da üzünə açıqdır. Onların qapısı kərəm qapısıdır.

Ustad Şeyx Bəhai bir dəfə öz yaxın tələbələri ilə birgə (onların arasında dahi hədis alimi Əllamə Məclisi də var-

dı) İsfahanın qəbirstanlığına, qəbr əhlini ziyarətə getmişdi. Baba Rüknəddinin qəbrinin yanından keçəndə qəbirdən bir səs eşitdi. Şeyx tələbələrindən soruşdu: “Bir səs eşitdinizmi?” Tələbələr heç bir səs eşitmədiklərini dedilər. Onlar Şeyxdən nə eşitdiyini sual etdikdə, buyurdu: “Bu qəbirdən mənə nida gəldi: “Ya Şeyx, öz aqibətin haqqında fikirləş”. Yəni, ölümün yaxınlaşıb.

Bu hadisədən altı ay keçməmişdi ki, o, hicri-qəməri tarixi ilə 1030-cu il rəcəbin 25-də İsfahan şəhərində dünyasını dəyişdi. Onun pak cənazəsini Məşhəd şəhərinə apararaq İmam Rzanın (ə) hərəminin yaxınlığındakı evində dəfn etdilər.

# ŞAH ABBASIN MƏŞHƏD ZİYARƏTİ

Məsum İmamların (ə) ziyarətinə piyada getmək şiələr arasında qədim adət-ənənələrdən biridir. Bu ənənəyə adi camaatdan başqa din alimləri və şahlar da həmişə riayət ediblər. Tarix bir çox belə olayları özündə qeyd etmişdir. Bunlardan ən məşhuru I Şah Abbasın ziyarət səfərləridir. Tarixi qaynaqlara görə, I Şah Abbas Müqəddəs Məşhəd ziyarətinə 3 dəfə piyada getmişdir (hicri qəməri 1006-cı il, 25 zilhiccə, 1008-ci il və 1009-cu il).

Şah öz nəzirini vermək üçün İmam Rzanın (ə) ziyarətinə piyada getmək istəyir. Lakin Şeyx Bəhayi və Mirdamad şahın əziyyət çəkməməsi üçün onu bu işdən çəkindirməyə çalışırlar. Şah istixarə elətdirir. İstixarədə bu ayə gəlir: "Mən sənin Rəbbinəm, başmaqlarını çıxart, çünki sən müqəddəs Tuva vadisindəsən!"[22] Şah Abbas deyir: Siz mənim işimi bir az da çətinləşdirdiniz, (piyada getmək istəyirdim), indi gərək ayaqyalın gedim.

Tarix yazır: I Şah Abbasın piyada Məşhəd ziyarətlərindən biri də 1008-ci ilin qış aylarına düşür. O bütün qışı İmam Rzanın (ə) hərəmində xidmətçi kimi işləyir, hərəmin təmir, bərpa və gözəlləşdirmə işləri ilə məşğul olur, həmçinin təmizlik işlərinə, şamların və çıraqların düzəldilməsinə kömək edir.

---

[22] "Taha", ayə 12.

I Şah Abbas həmçinin 1009-cu ildə nəzirini yerinə yetirmək məqsədilə piyada İmam Rizanın (ə) ziyarətinə yola düşür. Bunun üçün 28 gün yol getməli olur. Bu səfərində şah hərəmin genişləndirilməsi göstərişini verir və ilk dəfə olaraq İmam Rizanın (ə) hərəminə qızıl günbəz qoyulması işi başlanılır. Bu iş 1016-cı ildə başa çatır[23].

[23] İskəndər bəy Münşi, "Tarixi-aləmarayi-Abbasi". c. 1, səh. 206.

## İMAM RZA (Ə) BARƏDƏ MARAQLI ƏHVALAT

Hacı Şeyx Məhəmmədməhdi Tac nəql edir: Danışacağım dastan mərhum Şeyx İbrahim Türk haqqındadır. Bu əhvalat mərhum Şeyx Məhəmmədtəqi Bafəqi Yəzdinin kitabında da yazılmışdır. Dastan belədir ki, Şeyx İbrahim Türk adlı bir şəxs İmam Rizanın (ə) ziyarətinə gedir. Bir müddət orada qaldıqdan sonra pulu qurtarır. Ailəsinə, uşaqlarına sovqat almağa pulu olmadığı üçün pis vəziyyətə düşür. O deyir: "Pul qazanmaq məqsədilə şəhərin böyüklərindən birinə mədhiyə yazıb ondan pul almaq istəyirdim. Birdən ürəyimə gəlir ki, İmam Rizanın (ə) hərəmində ola-ola, nə üçün pula xatir digərlərindən nəsə istəyim. Həmin dəqiqə istiğfar etdim və mədhiyyəni İmam Rza (ə) üçün yazdım. Sonra İmamın (ə) hərəminə daxil oldum. Ziyarətdən sonra ərz etdim: "Ey İmam Riza (ə), sənin üçün mədhiyyə yazmışam və ənam istəyirəm". Ahəstə yazdığım mədhiyyəni oxudum. Sonra müqəddəs zərihə yaxınlaşıb öpüb hacətimi dilə gətirdim. Bir az gözlədim, amma nəticəsi olmadı. Narahat oldum. Ərz etdim: "Ey ağa, bu şeiri səndən başqa hər kimə oxusaydım mütləq ənam verərdi. Lakin sizdən hələ bir xəbər yoxdur".

Narahat halda hərəmdən çölə çıxdım. Hərəmin həyətindən çıxmaq istəyirdim ki, birdən heybətli bir şeyxi gördüm və irəli gəlib mənimlə görüşüb dedi: "İmamın ənamı-

nı al və bundan sonra o həzrətlə ədəbsiz danışma". Görüşdükdən sonra əlimdə bir zərf gördüm. Amma o adamın heybətindən bir söz deyə bilmədim və keçib getdim. Zərfi açdım, içində 120 min tümən pul vardı. Bu pul bütün xərclərimə bəs edirdi.

Bu hadisədən bir neçə dəqiqə sonra o şeyxi tanımaq üçün hərəmin həyətinə getdim. Mənim o şeyxlə olan söhbətimə şahidlik edən xadimdən soruşdum. Mənimlə söhbət edən şeyx kim idi? Cavab verdi: O, İmam Rizayla (ə) birbaşa əlaqədə olan Hacı Şeyx Həsənəli İsfahanidir.

## İMAM RZADAN (Ə) NƏQL OLUNAN MÖTƏBƏR BİR HƏDİS

İmam Rzadan (ə) nəql olunan bir hədisdə deyilir ki, bir gün İmam Rza (ə) Mədinədə yerləşən cəddi Rəsulullahın məscidinə namaz qılmağa gəlir. İmam Rza (ə) namazda ikən bir neçə insan İmam Əli (ə) haqqında söhbət etməyə başlayırlar. Getdikcə, söhbətləri dərinləşir və genişlənir. Nəhayət, İmam (ə) namazını bitirir və onlardan nə barəsində danışdıqlarını soruşur? Onlardan biri deyir ki, biz imamət və İmam Əli (ə) barəsində söhbət edirik. Söhbət edirik ki, İmam Əli (ə) kimdir, məqamı nədir? İmam Rza (ə) təbəssüm edib buyurur ki, bu bir mövzudur ki, sizin kimi adi insanların bundan bir nəticə əldə etməsi qeyri-mümkündür. Bunun üçün sizin beyin tutumunuz az, məqam isə bu mövzudan qat-qat böyükdür. Bunu unutmayın, üç şey vardır ki, siz bunların barəsində nə qədər danışsanız, heç bir nəticə əldə edə bilməzsiniz. Bunlardan biri Quranın mütəşabih ayələridir. Buna nümunə kimi, Əshabi-Kəhfin əhvalatıdır ki, 309 il onlar yatdılar hər şeyi çürüdən torpaq onlara heç bir təsir göstərmədi. İnsan bədəninə təsir göstərən günəş, ay, külək və s. Kəhfin Əshabinə təsir göstərə bilmədi. Bu barədə insan beyni nə qədər düşünsə, nəticə ala bilməz. Nəticə ala bilməz ki, niyə bu Kəhfin əshabı çürümədi, onların yaşaması necə olurdu ki, yemədən, içmədən mümkün olurdu? Çünki, bu kiçik beyinlərin

düşüncə çərçivəsindən kənar olan bir işdir ki, rədd etsək kafir, qəbul etməkdə isə acizik. Bu, Quranın təvilidir ki, həqiqi olmasına şübhəmiz yoxdur, amma kiçik beynimizin bunu dərk etməsi mümkünsüzdür. İkincisi insan vücudunda olan ruhdur. İnsanın nəfsi, bütün orqanları daxil olmaqla, insan nə etsə, hər bir hərəkəti ruha bağlıdır. Bəs ruh özü nədir? Allah-təala bunu peyğəmbərə (s) belə, düşünmək imkanı vermədi ki, siz onu dərk edə bilməzsiniz. O, var, bütün bədən onun üzərindədir, amma necədir, bunu insan nə qədər düşünsə, nəticə əldə edə bilməz. Bu da ona görədir ki, beyin kiçik, haqqında söhbət açılan ruh isə olduqca böyükdür. Bunun araşdırılmasına sərf olunan vaxt boş və olduqca səmərəsizdir. İmam (ə) bunu araşdırmağın insan təfəkküründən kənar olduğunu bildirir. Üçüncüsü isə, imamət və ya İmam Əli (ə) varlığıdır. İmaməti hər kəs görə bilər və bilə bilər, amma onu tanımağı əsla bacarmaz. İmamət Allahın bəşər üzərində ali nümunəsidir ki, dərk olunmaz, ən ali varlıqlardırlar ki, onların haqqında nə qədər danışsaq da, nə onların haqqını əda edə bilərik, nə də onlar barəsində bir nəticəyə gələ bilərik. İmam Əli (ə) bu siyahıda birincidir. Əli (ə), haqqında danışılası çox söhbətlərin olduğu ali bir şəxs, amma əqlin dərkinin xaricində olan sonsuz dəryanın özüdür. Əzəmətindən yalnız onu deyə bilərəm ki, Əli (ə) Allahın evində doğulan yeganə şəxsdir ki, Allah onu və anasını öz evində üç gün qonaq saxladı”.

## AYƏTULLAH MÖHSÜN QİRAƏTİDƏN MARAQLI BİR HADİSƏ

Qiraəti yazır: “Bir yəmənli cavan mənə belə söylədi: “Bir dəfə məsciddə xütbə oxuyan əhli-sünnə xətibinə yaxınlaşaraq soruşdum: “Peyğəmbərdən (s) sonra neçə imam İslama rəhbər olmalıdır?” Xətib dedi: “12 imam (Əhli-sünnənin nəzərinə görə də 12 imam olmalıdır – H.H.)”. Soruşdum: “Kimdir onlar?” Xətib dedi: “Əbu Bəkr, Ömər, Osman, Əli və s, sonuncusu Məhdi olacaqdır”. Soruşdum: Birinci imamları kim seçdi? Xətib dedi: “İnsanlar seçdilər”. Soruşdum: “Onda biz kimi gözləyirik? Gəlin yığışaq və aramızdan bir nəfəri seçək, olsun bizim Mehdimiz!” Xətib dedi: “Yox, Mehdini Allah özü seçməlidir”. Dedim: “Niyə ki? Birincisini biz seçə bilərik, amma sonuncusunu yox?! Birincisini seçmişiksə, sonuncusunu da seçə bilərik! Yox sonuncusunu seçə bilməriksə, deməli, birincisini də seçə bilməzdik. Sonuncusunu Allah seçməlidirsə, deməli, birincisini də Allah seçmişdir”.

# IV FƏSİL

## “BİSMİLLAH” AYƏSİNƏ İMAM RZANIN (ə) MƏHƏBBƏTİ

“Bismillah” ilahi rəng göstəricisi, tövhid cəhətinin nişanıdır.

İmam Rza (ə) buyurmuşdur: “Bismillah” insanın özünə Allah bəndəsi nişanı vurmasıdır.”

“Bismillah” tövhid rəmzidir. Bu ad əvəzində başqa adın çəkilməsi küfr rəmzi sayılır. “Allah” adını başqa adlarla bir tutmaq isə şirk əlamətidir. Nə Allahın adı ilə yanaşı, nə də Onun adının yerinə başqa ad çəkməyək. Allahın təkcə zatı yox, adı da şəriksizdir. İşə Allah və Məhəmməd (s) adı ilə başlamaq da qadağan olunmuşdur.

“Bismillah” davam rəmzidir. Çünki Allah boyasında olmayan hər bir şey fanidir.

“Bismillah” Allaha eşq və Ona təvvəkkül rəmzidir. Rəhman və Rəhim olan kəsə sevgi göstərək, işimizi Ona təvəkküllə başlayaq. Onun adını çəkmək mərhəmətinin əldə olunmasının səbəbidir.

“Bismillah” təkəbbürdən uzaqlaşma və İlahi dərgaha acizliyin izharı rəmzidir.

“Bismillah” bəndəlik yolunda ilk addımdır.

“Bismillah” şeytanı qaçıran səbəbdir. Allaha yaxın olan insana şeytan tə’sir edə bilməz.

“Bismillah” işlərin paklanma və sığortalanma səbəbidir.

“Bismillah” Allahın zikridir. Yəni “bismillah” deyən kəs Allahı unutmadığını bəyan edir.

“Bismillah” insanın məqsədini açıqlayır. İnsan “bismillah” deməklə izhar edir ki, Pərvərdigara, hədəfim xalq, zalım hakimlər, görüntülər, həvəslər yox, yalnız Sənsən!

İmam Riza (ə) buyurmuşdur: “Bismillah” ismi-əzəmə gözün qarası ağına yaxın olduğundan da yaxındır”[24].

[24] “Təfsiri-Nur”.

# İMAM RZANIN (ə) BUYURDUĞU HƏDİSLƏR

İmam Rza (ə) buyurmuşdur:

1. Biz Əhli-beyt (ə) Allahın gözəl adlarıyıq. Bizi tanımadan kimsənin əməli qəbul olmaz”.[25]

2. Hər kim sübh və şam vaxtı üç dəfə “Bismillahir rəhmanir rəhim. La həvlə və la quvvətə illa billahil əliyyüləzim” sözlərini desə, şeytandan, hökmdardan, xora və başqa xəstəliklərdən qorxusu olmaz.

3.İlahi! Peyğəmbər (s) balasını qətlə yetirənə, Sənin kitabını təhrif edənə, Sənin ayələrinlə döyüşənə, ayələrinə məsğərə edənə, Sənin ibadətinə qarşı təkəbbürlülük edənə, Sənin övliyalarını qətlə yetirənə, özlərinə layiq olmayan yerdə oturana və insanları Məhəmmədin (s) ailəsinin boynunda oturdan o iki nəfərə lənət et. İlahi, onlara ard-arda lənət et. O ikisini və onlara tabe olanları cəhənnəmdə məşhur et. İlahi, biz o ikisinə lənət deməklə, dünya və axirətdə o ikisindən uzaq olmaqla, sənə yaxınlaşırıq. İlahi, Əmirəl-möminin (ə), Hüseyn İbn Əlinin (ə), Həsən İbn Əlinin (ə) və Fatimə binti-Rəsullalahın (s.ə) qatilinə lənət et. İlahi, onlara əzab üstündən daha şiddətli əzab, zəlillik üstündən daha da zəlillik, xar olmaq üstündən daha da xar

---

[25] Şeyx Kuleyni. “Üsuli-Kafi”. c.1, səh.143.

olmaq nəsib et”[26].

4. Həzrəti-Musanın (ə) üzüyünün üzərində Tövratdan əxz edilmiş iki cümlə həkk edilmişdir: Səbr et, əcrini (cavabını) alarsan və doğru danış, xilas olarsan”.

5. Allah-təala buyurur: “Bəndələrim mənə itaət edəndə razı oluram və razı olduğum zaman bərəkət verirəm ki, mənim bərəkətim sonsuzdur”.

6. Dırnağı qısaltmaq ruzini artıran amillərdən biridir.[27]

7. Bizim müsibətimizi yad edən və məzlumiyyətimizə ağlayan kimsə qiyamət günü bizimlə bərabər bizim dərəcəmizdə olar”.[28]

8. Bir çox insan vardır ki, dünyada əylənər, zarafat edər və çox gülər, qiyamətdə isə çox ağlayar. Bir çox insan vardır ki, dünyada günahlarından qorxduğundan çox ağlayar, qiyamət günündə isə cənnətdə çox sevinər və gülər.[29]

9. Uşağa əmr et, öz əli ilə sədəqə versin, hərçənd bir çörək parçası və ya bir ovuc bir şey olsa belə. Çünki Allah yolunda verilən hər bir şey düz niyyətlə olsa, az da olsa çoxdur.[30]

10. Var dövlət beş xasiyyətlə toplana bilər: qəti xəsisliklə, uzun-uzadı arzularla, böyük hərisliklə, qohumluq əlaqəsini kəsməklə və dünyanı axirətdən üstün tutmaqla.

---

[26] Əbül-Qasim. Rza əd-Din Əli bin Musa bin Cəfər bin Mühəmməd bin Tavus əl-Huseyni. Muhəccud-Dəavat və Mənhəcul-İbadət. cild1, səh. 307.

[27] “40 məclis, 1000 hədis”.

[28] “Biharül-ənvar”. c. 44, səh. 278.

[29] Şeyx Səduq. “Uyuni-əxbar əl-Rza (ə). tərc. səh. 268, hədis 5.

[30] Şeyx Kuleyni. “Üsuli-kafi”, c.10, səh. 4, hədis 4.

11. Dovşan əti (sizə) haram edilmişdir. Çünki o pişik kimidir. Pişiyin və digər vəhşi heyvanların pəncəsi kimi onun da pəncəsi vardır.[31]

12. Hər kəs evdən xaric olanda on dəfə "İxlas" surəsini oxusa, qayıdana qədər Allah və onun mələkləri həmin şəxsi pis hadisələrdən qoruyar.[32]

13. Mömində Allaha məxsus olan bir xüsusiyyət – sirləri gizlətmək, Peyğəmbərə (s) məxsus olan bir xüsusiyyət – camaatla xoş davranmaq, İmama (ə) məxsus olan xüsusiyyət – çətinlik və bəla vaxtı səbr etmək olmalıdır".

14. Həqiqətən, nicat tapdı (o kəs) ki, özünü pak etdi, təkamülə yetişdi və zəkat verdi və öz Rəbbinin adını zikr etdi və namaz qıldı.[33]

15. Ey Şəbibinin oğlu, əgər hər hansı bir şeyə ağlamaq istəsən, o zaman Hüseyn ibn Əli ibn Əbu Talibə ağla. Çünki qoçun başı kəsildiyi kimi onun başını kəsdilər.[34]

16. Həzrəti-Xızır (ə) həyat bulağının suyundan içdi. O, sağdır və sur üfürülən zamanadək dünyada qalacaqdır. O, bizim yanımıza gəlir və bizə salam verir. Biz onun səsini eşidir, amma özünü görmürük. O, həcc mərasimində iştirak edir, bütün həcc əməllərini yerinə yetirir. "Ərəfə" günündə Ərafat çölündə dayanıb möminlərin dualarına "amin" deyir. Allah onun vasitəsilə qeyb zamanında bizim Qaimimizin qəribçiliyini aradan qaldırır, vəhşətini ünsiy-

---

[31] Vəsailuş-şiə, c.16, səh. 383.
[32] "Üsuli-kafi". c. 4, səh. 320.
[33] Əla, 14-15.
[34] "Biharul-Ənvar". c. 44, səh. 285-286.

yətə çevirir.[35]

17. Qaynanmış su hər şey üçün faydalıdır və heç bir ziyanı yoxdur.[36]

18. Kiçik günahlar böyük günahlara açılan bir yoldur. Az günahda Allahdan qorxmayan, çox günahda da ondan qorxmaz.[37]

19. Həzrəti-Əlinin Qədir-Xumdakı vilayətinə inanan möminlər, eynilə Adəmə səcdə edən mələklər kimidir. Onu qəbul etməyənlər isə səcdə etməyən İblisə bənzərlər.

20. Şiələrimizdən elə bir kəs yoxdur ki, bəlaya mübtəla olub, əziyyət çəkə və buna səbr edə, amma Allah ona min şəhidin savabını yazmaya.[38]

21. Allahım! Daxilimdə iki şeyi qüvvətləndir: imanı və səbri. Çünki birincisi malik olduqlarımı çoxaldar, ikincisi isə malik olmadıqlarımı mənə yaxınlaşdırar.

22. Şübhəsiz, qurtuluş ümidsizlikdən sonra gəlir.[39]

23. Əgər mömin haramı özündən uzaqlaşdırsa, yetmiş həccin savabına nail olar.

24. Allah, qadınların saçlarına baxmağı haram buyurmuşdur. Çünki kişilərin şəhvətli baxışları fəsada səbəb olar.

25. O zaman ki, Qiyamət günü olar və möminin əməl dəftəri ona təqdim olunar, günahlarına baxan zaman rəngi dəyişər. Bədəni titrəməyə başlayar.

---

[35] "Biharul-Ənvar". c.13, səh. 299.
[36] "Məkarimül-əxlaq". səh. 157.
[37] "Biharül-ənvar". c. 68, səh. 174.
[38] "Usuli-Kafi". c. 1, səh. 354.
[39] Əllamə Məclisi. "Biharül-ənvar". 52/110/17.

26. İmam Rza (ə) Riyan ibni Şəbibə buyurur: "Əgər Seyyidüş-şühədanın (ə) bayrağı altında şəhid olan kəsin savabının sənin üçün olmasını istəyirsənsə, de: "Ey kaş, Aşura günü onlarla olaydım və böyük zəfərə çatardım".

27. İbadət çoxlu oruc və namaz yox, yaradılış haqqında (Allahın yaratdıqlarını) düşünməkdir.

28. İmam Mehdi (ə.f) xarici baxımdan gənc görünsə də yaşı çoxdur. Ona baxan elə güman edər ki, onun 30 ya daha az yaşı vardır Onun başqa bir əlaməti də zamanın keçməsinə baxmayaraq qocalmamasıdır.

29. Ən üstün ağıl insanın özünü dərk edib tanımasıdır.

30. Bir gün Həzrəti-Məhəmməd (s) səhabələrindən, bir kişini soruşdu: "Filankəs nə haldadır?" Dedilər: "Bir müddətdir ki, çarəsiz olubdur və qanadı sınmış quş kimi dolanır (Yaşayışı çətinliklə keçir). Həzrəti-Məhəmməd (s) qalxdı və onu görmək üçün onun evinə getdi. Xəstə və giriftar kişi həqiqətdə əziyyət içində idi. Həzrəti-Məhəmməd (s) bildi ki, onun əziyyətə və sıxıntıya düşməsi adi bir iş deyildir. Ona görə ondan soruşdu: "Öz haqqında nifrin edibsən?" Xəstə kişi bir az fikirləşib dedi: "Bəli! Elədir. Mən dua məqamında demişdim: "İlahi! Əgər qərardır ki, axirətdə bulaşdığım günahlarıma görə məni cəzalandırasan, səndən istəyirəm ki, məni cəzalandırmağı tezləşdirəsən və onu bu dünyada qərar verəsən". Həzrəti-Məhəmməd (s) dedi: "Ey kişi! Nə üçün öz haqqında belə bir dua etmisən?! Məgər nə olardı ki, Allahdan həm dünyanın səadətini və həm də axirətin səadətini istəyərdin və öz duanda bu ayəni oxuyardın: "İlahi! Dünyada bizə yaxşılıq və axi-

rətdə bizə yaxşılıq ver və bizi odun əzabından saxla".[40]

31. Camaatla qılınan namazın hər rəkəti, tək qılınan namazın 2000 rəkətinə bərabərdir.[41]

32. Əbdüssalam ibn Saleh Hərəvi belə nəql edir: "Mən İmam Rzanın "Allah bizim əmrimizi dirçəldən bəndəyə rəhm etsin!" buyruğunu eşitdikdə, "Əmrinizi necə dirçəltsin?" deyə soruşdum. Həzrət buyurdu: "Bizim təlimlərimizi öyrənib xalqa da öyrətsin. Əgər xalq sözlərimizin gözəlliklərini duysa, sözsüz, bizə tabe olar".[42]

33. Hər kəs Allahın pak və müqəddəs zatını Onun məxluqlarına oxşatsa, müşrikdir; hər kəs Allahın nəhy etdiyi pis bir şeyi Ona qoşsa (nisbət versə), kafirdir.

34. İman islamdan bir dərəcə fəzilətlidir; təqva imandan, yəqin təqvadan bir dərəcə əfzəldir. Adəm övladlarına (insanlara) "yəqin"dən fəzilətli bir xislət verilməmişdir.

35. İmanın dörd sütunu var: Allaha təvəkkül, İlahi müqəddərata razı olmaq, Allah fərmanı qarşısında təslim olmaq, işləri Allaha tapşırmaq.

36. Vacibləri yerinə yetirmək və günah işlərdən çəkinmək imandır. İman, həmçinin qəlbən Allahı tanımaq, dildə onu iqrar etmək və bütün bədənin üzvlərilə ona əməl etmək mə`nasındadır.

37. Bir gün Həzrəti-Rza (ə) Qur`anı yad edərək onun höccətlərinin əzəmətini və qafiyəli səcdə yazılmış mö`cüzə ayələrini bəyan edib, onun vəsiləsini, ilahi nümunə

---

[40] Qurani-Kərim. "Bəqərə" surəsi, ayə 201.
[41] "Biharül-ənvar". c. 88, həd. 4.
[42] "Üyuni-əxbarir-Riza (ə)". c.1, səh. 307, hədis 69.

kimi ali üsulunu şərh edib, göstərdi ki, Quran cənnətə getməyin amili və cəhənnəmdən qurtaran ən gözəl yoldur. Zaman onu köhnəltməz, dillərdə təkrar olunması onun dəyərini aşağı salmaz, çünki yalnız müəyyən bir zaman üçün deyildir. Qur`an höccət və böyük dəlil kimi bütün insanlar üçündür və heç cür batil (nə öndən, nə də arxadan) Qur`ana qarşı dura bilməz, çünki o, hikmət sahibi olan Allah tərəfindən göndərilmişdir.

38. Rəyyan deyir: İmam Rzaya (ə) ərz etdim: "Qur`an haqqında nə deyirsiniz?" Buyurdu: "Qur`an Allah kəlamıdır, ondan (qanunlarından) irəliyə keçməyin və ondan başqa bir şeydə hidayəti axtarmayın, yoxsa yolunuzdan azarsınız".

39. İmamlıq dinin yüyəni və qoruyanıdır, müsəlmanların intizama salınmaları, dünyanın sahmanlaşması və möminlərin izzəti səbəbidir. İmamlıq islamın göyərən kökü və yüksək qol-budağıdır.

40. Zalımlarla əməkdaşlıq etmək, onlara yardım etmək, ehtiyaclarını ödəmək üçün çalışmaq kafirliklə bərabərdir, onların üzlərinə bilə-bilə baxmaq, cəhənnəm odunun əzabına səbəb olan kəbirə günahlardır.

41. Allah bizim məsələmizi ehya edənə (dirildənə) rəhmət etsin. Oradakılardan biri, "sizin məsələniz necə ehya edilir" deyə soruşduqda, İmam buyurdu: "Bizim elmimizi öyrənib, başqalarına öyrətməklə".

42. Müsəlman bir adamın bu on sifəti olmayınca, ağlı kamil olmaz: Xalq onun xeyirli (işlərinə) ümidvar olsun, xalq onun şərrindən amanda qalsın, başqalarının yaxşı işlərini çox hesab etsin, öz yaxşı işlərini az bilsin, yoxsul-

ların ona üz gətirmələrindən narahat olmasın, bütün ömrü boyu elm öyrənməkdən yorulmasın, Allah yolunda yoxsul olmağı varlı olmaqdan üstün bilsin, Allah yolunda olan zilləti Allah düşmənlərinin yolunda olan izzətdən (şərəfdən) üstün bilsin, adsız yaşamağı, adlı-sanlı yaşamaqdan ləzzətli bilsin. Sonra Həzrət buyurdu: "Onuncu". Bir şəxs soruşdu: Onuncu nədir? Buyurdu: "Ən əhəmiyyətlisi isə gördüyü hər kəsi özündən daha yaxşı və daha təqvalı saysın".[43]

43. Hər kim öz nəfsinin hesabını çəksə, qazanar; hər kim ondan qafil olsa, ziyan görər. Hər kim Allahdan qorxsa, amanda olar; hər kim ibrət alsa, bəsirətli olar. Hər kim bəsirətli olsa, anlayar və hər kim anlasa, elmi çoxalar.

44. Övlad qarşısında ata-ananın vəzifəsi ona yaxşı ad qoymaq, ədəb öyrətmək və Quran təlim etməkdir.

45. Bir nəfər İmam Rzadan (ə) soruşdu: "Ən yaxşı bəndə kimlərdir?" İmam buyurdu: "Yaxşı iş gördükdə sevinən, pis iş gördükdə istiğfar edən, onlara bir ne`mət verildikdə şükür edən, imtahanda dözümlü olan, qəzəbləndikdə əfv edən və bağışlayan adamlardır".

46. İslamın proqramlarından biri böyük günahlardan uzaqlaşmaqdır. Məsələn, Allahın haram etdiyi adam öldürməkdən uzaq durmaq, zina etməmək, oğurluq etməmək, içki içməmək, ata-ananı incitməmək, müharibə meydanından qaçmamaq, zülm ilə yetim malını yeməmək, murdar ət yeməmək, qan içməmək, donuz əti və Allahın zikriylə zibh olunmayan heyvanların ətini yeməmək, (zərurətdən başqa)

---

[43] "Biharul-Ənvar" Beyrut çapı, c.75, səh.336.

ribaxorlıq (aydın olandan sonra) etməmək, haram mal yeməmək, qumar oynamamaq, əskik satmamaq, pak qadınlara töhmət vurmamaq, livat etməmək, yalandan şahid olmamaq, Allahın rəhmətindən ümidi qırmamaq, zalımlara yardım etməmək, zalımlara arxalanmamaq, yalandan and içməmək, başqalarının haqlarını vermək, yalan danışmamaq, təkəbbür etməmək, israf etməmək, həddindən artıq yeməmək, xəyanət etməmək, həcc mərasimini yüngül saymamaq, Allahın övliyaları ilə düşmənçilik etməmək, faydasız işlərlə məşğul olmamaq, günah işdə israr etməmək.

47. Xudbinliyin (ücbün) dərəcələri vardır: Bəzən bəndənin pis əməlləri yaxşı cilvələnər və gözəl bir iş gördüyünü zənn edər, ona xulbinlik gətirər. Bə`zən də Allahına iman gətirməyi ilə Ona minnət qoyar, halbuki, iman Allahın ona qoyduğu minnətdir.

48. Əgər Allah insanları cənnət və cəhənnəmlə, xəbərdarlıq edib, qorxutmasaydı, yenə də layiq olmadıqları halda onlara lütf və ehsan olaraq verdiyi nemətlərin qarşısında Allaha itaət etmələri və üsyan etməmələri vacib olacaqdı.

49. İnsanlar oruc tutmağa nə üçün əmr olunmuşlar, sualının cavabı belədir: Onlar əmr olunmuşlar ki, aclıq və susuzluğun dərdini bilsinlər və beləliklə, axirət və qiyamət gününün susuzluğu və aclığını düşünsünlər. Nəticədə oruc tutanlar təvazökar, mülayimrəftar olub ilahi mükafata yetişsinlər və qəsdən düşdükləri aclıq və susuzluğa dözsünlər, bundan əlavə, oruc nəfsani istəklərin büruz etməsinin qarşısını alar. Bu, dünyada öyüd verən olar, insanları dini vəzifələrə təslim edər, qiyamət gününün yol göstərəni

olar. Bu iş (oruc tutmaq) yoxsuların ağır güzəranını onlara öyrədər və nəticədə Allahın yoxsullar üçün vacib etdiyi infaqları (sədəqələri) yoxsullara verərlər.

50. Namazın camaatla qılınması, Allaha ixlas, təslim və ibadətin, tövhid və islamın açıqca icra olunması və göz qarşısında əməl olunması üçündür. Çünki, bunların aşkar olunması Qərbdə və Şərqdə yaşayan hər kəsə Allahın vəhdaniyyətinə bir hüccətdir. Həmçinin camaat dilləriylə iqrar etdikləri halda, dinə laqeyd və ikiüzlü olanların islamın zahirini iqrar etməyə məcbur olduqları şeyə boyun əyməməri və insanların bir-birinin lehinə şahidlik edə bilmələri üçündür. Bunlarla birlikdə camaat təqva və yaxşılıqda bir-biri ilə həmkarlıq edir, bir çox günahın qarşısını alır.

51. Allah Qur`anda üç şeyi üç şeylə istəmişdir: 1)Namazı zəkatla birlikdə istəmişdir. Hər kim namaz qılıb zəkat verməsə, onun namazı qəbul olunmaz. 2)Allah özünə itaət etməyi ata-anaya itaət etməklə birlikdə istəmişdir. Hər kim ata-anaya hörmət göstərməzsə, Allaha şükür etməyən sayılar. 3)Allahdan qorxmağı (təqvanı) qohumlarla yaxşı münasibətdə olmaqla (sileyi-rəhmlə) birlikdə istəmişdir. Hər kim qohumlarla yaxşı münasibətdə olmasa, ilahi təqvaya riayət etməmişdir.

52. Yaxşı iş görməyi və ibadətdə çalışmağı Ali-Məhəmmədin (ə) məhəbbətinə kifayət etməklə buraxmayın.

53. Həsəd və tamahdan uzaq olun, çünki bu iki xislət keçmiş ümmətləri həlak etmişdir. Həmçinin, paxılıqdan da özünüzü qoruyun, çünki, paxılıq bir növ bəladır. Mö`min və azad insan bu xislətin sahibi olmaz. Paxıllıq sifəti imana ziddir.

54. Sükut hikmət qapılarından biridir. Sükut məhəbbət

yaradar və hər bir yaxşı işin göstəricisidir.

55. Dostunla təvazökarlıqla davran, düşməninlə ehtiyatlı ol və bütün adamlara açıq və gülər üzlə yanaş.

56. Allah faydasız danışığı, malı hədər etməyi və çox sual verməyi düşmənçilik bilir.

57. Paxıl adamın rahatlığı olmaz və həsudun (çox həsəd edənin) yaşayışı xoş olmaz. Şahlar vəfasızdırlar. Yalançı adamda igidlik olmaz.

58. Namazın hikməti, Allahın rububiyyəyini və şəriki olmadığını e`tiraf etmək və Cabbar olan Allahın qarşısında zillət, kiçiklik və sadəlik ilə dayanmaq və keçmiş günahlarına e`tiraf edib, bağışlanmaq istəməkdir. Gündə beş vaxt Allahı böyük sayaraq üzü yerə qoymaqdan ibarət olan namaz, Allahı əbədi bilib Onu unutmamaq, qorxu (xuşu) içində Onun hüzurunda özünü zəlil saymaq, din və dünya ilə əlaqədar olaraq verdiyi nemətləri artırmasını istəməkdir. Namaz gecə-gündüz Allahı daimən xatırladır, nəticədə bəndənin azmasına və həddi aşmasına mane olur, ona mövlasını, imanını, yaradanını xatırladır. Çünki, Rəbbini xatırlayaraq Onun hüzurunda durmaq, günah və pozğunluqların qarşısını alır.

59. Ən yaxşı əxlaq, xeyir işləri görmək, sıxıntıda olanların dadına çatmaq, başqalarının istəklərini tə`min etməkdir. Paxıllıq adamın abrını aparar, dünyaya bağlılıq isə giriftarçılığa və əziyyətə səbəb olar.

60. İçki içənlə oturub-durma, ona salam da vermə.

61. Allah ona görə şərabı haram etmişdir ki, şərab pozğunluq törətməyə və onu içən adamın ağlını aparıb, Allahı inkar etməsinə, Allaha və Onun Peyğəmbərinə iftira deməsinə səbəb olur. Şərab həmçinin fəsad, qətl, töhmət, zi-

na və Allahın halallarından çəkinməyə yol verir, buna görə də hökm etmişik ki, hər cür məstedici içkilər haramdır. Çünki bu içkilər də şərabın törətdiyi pis nəticələri törədir.

62. Yeddi şey olmadan yeddi şeyi etmək özünü ələ salmaqdır: 1)Hər kim ürəkdən peşman olmadan dili ilə bağışlanmasını dilərsə, özünü ələ salmışdır. 2)Hər kim Allahdan tövfiq istəsə, amma ciddiyyət göstərməsə, özünü ələ salmışdır. 3)Hər kim ehtiyatlı olmaq istəsə, amma muğayat olmazsa, özünü ələ salmışdır. 4)Hər kim Allahdan behişt istəsə, amma çətinliklərdə səbri olmasa, özünü ələ salmışdır. 5)Hər kim cəhənnəmdən Allaha pənah aparsa, amma dünyəvi ləzzətləri tərk etməsə, özünü ələ salmışdır. 6)Hər kim Allahı zikr etsə, amma Ona qovuşmağa aşiq olmasa, özünü ələ salmışdır. (Diqqət: bu hədisdə yeddi mövzu yerinə altı mövzu haqqında yazılmışdır – H.H.).

63. Hətta şərbət verməklə də olsa, öz qohum-əqrəbalarınla əlaqə yarat. Əlbəttə, ən yaxşı sileyi-rəhm etmək qohum-əqrəbanı incitməməkdir.

64. Az varından da sədəqə ver, çünki Allah niyyəti ilə verilən (hətta az sədəqə belə) çox hesab olunacaqdır.

65. Müsəlman bir yoxsulla görüşən adam ona varlı adama verdiyi salamdan yüngül salam versə, qiyamət günündə Allah ona qəzəblənəcəkdir.

66. Bir-birinizlə görüşün, bəlkə dostluqlarınız artsın.

67. Günahdan tövbə edən adam günahsız adam kimidir.

68. Paklıq və təmizlik Peyğəmbərlərin əxlaqındandır.

69. Ən yaxşı mal odur ki, insanın abırı onunla hifz olar. Ən üstün ağıl özünü tanımaqdır.

70. Peyğəmbərlərin silahına sarılın! "Peyğəmbərlərin silahı nədir" deyə soruşulduqda, "duadır" deyə cavab verdi.

71. Bil ki, Allah sənə rəhmət edər. Allah hər cür qumarbazlığı haram etdi və öz bəndələrinə buyurdu: Qumardan çəkinin və onu pis bir iş tanıtdırdı. Allah buyurdu: pislik şeytan işidir, ondan qorunun. Məsələn: şahmat, nərd və başqa qumar oyunları. Nərd oyunu, əlbəttə şahmatdan pisdir.

72. Ağlın ən üstün mərtəbəsi insanı öz nəfsini tanımasıdır.

73. İmam Rzadan (ə) nəql olunur: Bir qadın İmam Baqirə (ə) ərz etdi ki, mən "müqəbəttilə"yəm (tərki-dünya olmuşam). Həzrət (ə) buyurdu: "Dünyanın harasını tərk etmisən?" Ərz etdi: "Qərara almışam ki, heç vaxt ərə getməyəm". Buyurdu: "Niyə?" Dedi: "İstəyirəm böyük fəzilətə çatam". Həzrət (ə) buyurdu: "Bu fikirdən dön, əgər bu işdə bir fəzilət olsaydı, xanım Fatimeyi-Zəhra (s.ə) buna səndən daha ləyaqətli idi. Çünki heç bir qadın heç bir fəzilətdə ondan qabağa keçməyib və keçməyəcəkdir".

74. Həqiqətən, camaat namazı dində xalislik, tək olan Allaha sitayiş etmək, Allaha ibadət edib Ona təslim olmağı aşkar etmək üçün müəyyən olunmuşdur. Çünki din hökmlərinin e`lan olunması və haqq bünövrələrinin bəyan edilməsiylə Allahın höccət və dəlili Şərq və Qərb əhlinə çatdırılır, islam dininin həqiqətləri aydınlaşır. Vahid Allaha sitayiş olunduğu üçün, artıq şirk və kafirliyin qaranlıq zülməti nurun qarşısında davam gətirə bilməz və nəhayət məhv olub gedəcəkdir. Bu zaman xalq bir-birini tanıyır və bir-birinə şahid dura bilmələri üçün şərait yaranır. Bu məqsədi həyata keçirmək üçün ən yaxşı şey camaat namazıdır. Bu toplaşma səbəb olur ki, xalq bir-birinə kömək əli uzatsın, ümumi mənafe xatirinə həmkarlıq etsin, çətinlikləri aradan qaldırsın, dindarlıqda, Allaha sitayiş etməkdə və çoxlu günahların qarşısını almaqda bir-birinə yardım etsinlər.

75. Etibarlı insan sənə xəyanət etməz. Sən səhvən xain saymısan.

76. Özünü sorğu-suala çəkən fayda aparar və özündən qafil olan ziyan çəkər.[44]

77. Hər kim bizdən (imamlardan) birini ziyarət etsə, İmam Huseyni (ə) ziyarət etmiş kimidir.

78. Həzrətdən soruşdular: "Necəsiniz?" Buyurdu: "Ömrüm azalır və əməllərim yazılır. Ölüm bizi izləyir, cəhənnəm arxamızcadır və bilmirik ki, bizimlə nə edəcəklər?"

79. Çarəsizlərə yardım etmək sədəqədən üstündür.

80. Ağıl insanın dostu, nadanlıq isə onun düşmənidir.

81. Böyük qardaş (hörmət cəhətdən) ata kimidir.

82. İmam Allahın, dinin qoruyucusudur.

83. İmam Hüseynin (ə) ziyarətinə sərf olunan günlər ömürdən sayılmır.

84. Bütün pisliklərin açarı qəzəbdir.

85. Xoş o şəxsin halına ki, ibadəti və duası ixlasla (Allaha görə) ola. Qəlbini gördüyü şeyə məşğul etməyə. Eşitdikləri onu Allahın zikrindən saxlamaya və bağışladığı şeyə görə qəmgin olmaya.

86. Allaha qarşı xoşgüman olun. Çünki Allah-təala buyurur: "Mən mömin bəndəmin gümanının yanındayam. Əgər o mənə xoşgüman olsa, mən də onunla yaxşı rəftar edəcəyəm. Əgər mənə bədgüman olsa, mən də onunla pis rəftar edəcəyəm".

87. Səxavətli şəxs başqalarının çörəyindən yeyir ki, onlar da onun çörəyindən yesinlər, paxıl isə yemir ki, onlar da onun çörəyindən yeməsinlər.

---

[44] "Üsufi-kafi". c. 2, səh.111.

88. Hər kəs möminə kömək etsə və onun çətinliyini həll etsə, Allah qiyamətdə onun ürəyini genişləndirər.

89. Nə zaman Allah bəndələri əvvəllər etdikləri günahlara yol verirlərsə, Allah onlar üçün tanımadıqları bəlalar yaradır.

90. Nar yeyin, çünki mədəyə gedən hər bir nar dənəsi qəlbi nurlandırar və şeytanı qırx gün lal edər.

91. Qonşusu onun şərindən amanda olmayan şəxs bizdən deyil.

92. Yaxşı işi gizlətməyin yetmiş savabı vardır. Hər kim pis işi faş etsə, xar olar. Hər kim onu gizlətsə bağışlanar.

93. Təvazökarlıq odur ki, camaatla rəftarında onların da səninlə o cür rəftarını istəyəsən.

94. Bəni-İsraildə 10 il sükut etməyiəni abid saymırdılar.

95. Hər kəs nəfsini cilovlasa, mənfəət əldə edər. Hər kim bu işdən qafil olsa, zərər görər. Hər kim amanda olacağından qorxsa və ibrət götürsə, bəsirət tapar. Hər kəs dərk etsə, alim olar.

96. Hər kim az ruziyə razı olsa, Allah da onun az saleh əməlinə razı olar.

97. Yaxşıdır ki, hər kəs sübh namazının təqibatından (namazdan sonra oxunan dualar) sonra Qurani-Kərimdən əlli ayə oxusun.

98. Məni sevənlərdən hər kim haqqımı bilərək məni ziyarət etsə, qiyamət günü ona şəfaət edəcəyəm.

99. Hər kim müsəlmanlarla məşvərətdə xəyanət etsə, mən onunla əlaqəmi kəsərəm.

100. Səbr, elm və sükut fəqihin nişanələrindəndir.

101. Allah bəndələrinin ən üstünü bu beş sifətə malik olanlardır: 1) Yaxşı iş görəndə sevinərlər; 2) Pis iş görən-

də tövbə edərlər; 3) Nemətə sahib olanda şükür edərlər; 4) Müsibət üz verəndə səbr edərlər; 5) Ona zülm olunanda bağışlayarlar.

102. Borc verməyin savabı sədəqədən on yeddi dəfə çoxdur. Çünki borc vermək möhtac olanın ehtiyacının qarşısını alır.

103. Əqiq qaşlı üzük taxan kasıb olmaz və onun əvəzi də (qiyamətdə) çox gözəl olar.

104. Sileyi-rəhm və gözəl əxlaq ömrü uzadır.

105. Allah-təala bütün peyğəmbərləri şərabın haram edilməsi ilə və Allahın bəda etməsini (təqdiri dəyişməsini) iqrar etməklə göndərib.[45]

106. "Ömrünün qurtarmasına üç il qalan bir şəxs qohumlarına yaxşılıq edərsə, Allah onun ömrünü otuz il uzadar və Allah istədiyini edər".[46]

107. "Bir içim su qədər də olsa, qohumlarına yaxşılıq et. Sənin qohumlarına etdiyin ən böyük yaxşılıq onlara əziyyət verməməyindir. Qohumlara yaxşılıq ölmümü təxirə salır və ailədə məhəbbət yaradır".[47]

108. "Biz qohumlara yaxşılıqdan başqa ömrü uzadan bir vasitə tanımırıq. Əgər bir şəxsin əcəlinə üç il qalmış yaxınlarına yaxşılıq edərsə, Allah onun ömrünü otuz il artırıb otuz üç il edər və əgər birinin əcəlinə otuz üç il qalmış qohumluq əlaqəsini kəsərsə, Allah onun ömründən otuz il azaldıb üç il edər".[48]

---

[45] Şeyx Kuleyni. "Üsuli-Kafi". c.1, səh. 199.
[46] "Vəsailuş-şiə", 15-ci cild, səh.243.
[47] "Üsuli-kafi", 2-ci cild, səh.151.
[48] "Üsuli-kafi", 2-ci cild, səh.157.

109. “Kiçik günahlar insanı böyük günahlara doğru sürükləyir. Hər kim kiçik günaha görə Allahdan qorxmazsa, böyük günaha görə də qorxmaz”.[49]

110. “Hər kim bir möminin qəmini aradan qaldırsa, Allah-Taala qiyamət günü onun qəlbinin qəmini aradan qaldırar”.[50]

[49] “Biharul-ənvar”, 73-cü cild, səh.353.
[50] “Əl-kafi”, 3-cü cild, səh.510.

# İMAM RZANIN (Ə) HƏYAT VƏ FƏALİYYƏTİ BARƏDƏ SUAL-CAVAB

**Sual-1.** İmam Rza (ə ) nə vaxt və harada dünyaya göz açıb?

**Cavab:** Hicrinin 148-ci ili Zilqədə ayının 11-i, Mədinə şəhərində.

**Sual-2.** İmam Rzanın (ə ) ata və anasının adı nədir?

**Cavab:** O Həzrətin atasının adı İmam Museyi-Kazım (ə), anasının adı isə Nəcmə (s.ə) idi.

**Sual-3.** İmam Rzanın (ə) həyatını neçə hissəyə bölmək olar?

**Cavab:** Üç hissəyə:

1) İmamətdən qabaqkı dövr.

2) İmamətdən sonrakı dövr Mədinə şəhərində.

3) İmamətdən sonrakı dövr Xorasan şəhərində.

**Sual-4.** İmam Rzanın (ə) yaşadığı dövrün ən məsuliyyətli hissəsi nə vaxt və neçə il oldu?

**Cavab:** İmam Rzanın (ə) İmamət dövrü və Xorasanda olduğu üç il o Həzrətin (ə) siyasi yaşayışının ən məsuliyyətli dövrü idi.

**Sual-5.** Nə üçün bir yerdən hərəkət edən iki müsafirə öz namazlarının necəliyindən sual verərkən, İmam Rza (ə) müxtəlif cavablar verdi?

**Cavab:** İmam Rza (ə) onlardan birinə buyurdu: "Sənin namazın şikəstdir". O birisinə buyurdu: "Sənin namazın

tamdır". Sonra İmam Rza (ə) "Sənin namazın tamdır" deyərək buyurduğu şəxsə məsələni belə izah etdi: "Çünki sən xəlifəni (zalım xəlifə Məmunu) görmək məqsədi ilə gəlmisən. Buna görə də sənin səfərin günah səfəridir və günah olan səfər namazın şikəst olmasına səbəb olmur".

**Sual-6.** İmam Rza (ə) nə üçün Xorasan şəhərinə dəvət olundu?

**Cavab:** Məmun öz hökümət sarayının əzəmətli, qüdrətli və elmi mövqeyə malik olması üçün başqa bir tərəfdən Həzrəti-Əlinin (ə) Əhli-beytinin (ə) tərəfdarlarının narazılığını azaltmaq və keçmişdəki zülmlərini islah etmək məqsədi ilə İmam Rzanı (ə) Mədinə şəhərindən Mərv şəhərinə dəvət etmək fikrinə düşdü. Məmun öz adamları ilə məşvərət edəndən sonra, xüsusilə, qoşun başçısı və ölkənin işlərini həll edən ağıllı, istedadlı bir şəxs olan Fəzl ibn Səhl ilə məsləhətləşəndən sonra demək olar ki, zor gücünə İmam Rzadan (ə) tələb etdi ki, Mədinədən Xorasana gəlsin.

**Sual-7.** "Silsilətüz-zəhəb" hədisi hansı hədisdir, kimin vasitəsi ilə və harada bəyan olubdur?

**Cavab:** İmam Rza (ə) Xorasana səfər etdiyi ərəfədə Nişapur şəhərinə çatdı. O Həzrət (ə) tövhid və Allahın birliyi haqqında bir hədis bəyan edərək buyurdu: "La ilahə illəllah" mübarək kəlməsi mənim möhkəm qalamdır, hər kəs ona mötəqid olsa, bu möhkəm qalaya daxil olacaq və əgər bu qalaya daxil olsa qiyamət gününün əzabından amanda qalacaqdır". İmam Rza (ə) o hədisdən bir qədər sonra özünə işarə edərək buyurdu: "Amma bunun şərti vardır. Mən onun şərtlərindən biriyəm".

**Sual-8** " Silsilətüz-zəhəb" kəlməsinin lüğəvi mənası nədir və nə üçün ona "Silsilətüz-zəhəb" deyirlər?

**Cavab:** "Silsilətüz-zəhəb" "Qızıl silsilə" deməkdir. Bu

hədisin raviləri arasında Peyğəmbərə (s) qədər bütün məsum imamlar olduğu üçün buna “Silsilətüz-zəhəb” deyirlər.

**Sual-9.** İmam Rzanın (ə) bəyan etdiyi “Silsilətüz-zəhəb” hədisi hansı mətləblərə malikdir?

**Cavab:** İmam Rzanın (ə) vasitəsi ilə bəyan olunmuş “Silsilətüz-zəhəb” hədisində üç mətləb ifadə olunur:

O Həzrət (ə) öz ata-babalarının adını nəql etməklə Həzrətin (ə) ata-babalarının bu hədisi bir-birindən nəql etdikləri aydın olur ki, bu silsilə Peyğəmbərə (s), Cəbrailə (ə), nəhayət Allah-təalaya uzanır. Yəni, Allahın dediyini Cəbrail (ə) Peyğəmbərə, o da imamət silsiləsinə ötürmüş, gəlib İmam Rzaya (ə) çatmışdır. İmam Rza (ə) da bu hədisi nəql etməklə həm də öz ata-babalarını xalqa xatırlatmışdır.

**Sual-10.** Hansı İmam “Ali-Mühəmmədin alimi” ləqəbi ilə tanınmışdır?

**Cavab:** İmam Rza (ə )

**Sual-11.** İmam Rza (ə) neçə yaşında və kimin vasitəsi ilə zəhərləndi?

**Cavab:** 55 yaşında, Məmunun vasitəsi ilə.

**Sual-12.** İmam Rza (ə) nə vaxt və harada şəhid oldu?

**Cavab:** Hicrinin 203-cü ili səfər ayının axırında, Nuqanın Sənabad məntəqəsində (hal hazırda ora Məşhədin məhəllələrindən biridir).

**Sual-13.** İmam Rzanın (ə) vəliəhdi kim idi və İmam (ə) şəhid olan vaxt onun neçə yaşı var idi?

**Cavab:** İmam Rzanın (ə) şəhid olduğu zaman Həzrəti-İmam Mühəmməd Təqinin (ə ) təqribən yeddi yaşı var idi.

**Sual-14.** İmam Rzanın (ə ) şərafətli qəbri hansı şəhərdədir?

**Cavab:** Məşhəd şəhərində.

# V FƏSİL

## İMAM RZA (ə) VƏ MƏSUMƏ XANIMIN (S.ə) ƏDƏBİYYATDA OBRAZI

Azərbaycan ədəbiyyatı tarixində İmam Rzaya (ə), eləcə də digər imamlarımıza həsr edilmiş çox sayda bədii sənət nümunələri vardır. Bu kitabda klassik poeziyamızdan və aşıq ələbiyyatımızdan iki nümunə ilə kifayətlənirik.

Seyid Əbülqasim Nəbatinin İmam Rza (ə) ilə bağlı aşağdakı beyti İmam (ə) haqqında təəssüratın XIX yüzillikdə də bütün aydınlığı və genişliyi ilə davam etdiyini sübuta yetirir:

*Gedərəm dadə əlindən sənin, ey düşməni-can,*
*Düşsə gər barigəhi-şahi-Xorasan əlimə!*[51]

(Ey mənim ruhuma düşmən kəsilən bədxah, əgər Xorasan şahının sarayının (İmam Rzanın Məşhəddəki türbəsinin) ziyarəti mənə müyəssər olsa, mütləq ona səndən şikayət edəcəyəm).

Nəbati kimi bir klassikin Məşhəd şəhərini belə güvənc yerinə çevirməsinin mütləq möhkəm dini əsasları olmalı idi. Aşağıdakı hədislər məhz belə nəqli dəlillər sırasında-

[51] Nəbati. Əsərləri. Bakı,1968, səh. 41.

dır. İslam rəhbəri (s) buyurmuşdur. “Çox çəkməz ki, qəlbimin bir parası Xorasan torpağında dəfn edilər. Hər bir qəm-qüssəli şəxs onu ziyarət etsə, hökmən Allah onu sevindirib, qəm-qüssəsini dağıdar. Hər bir günahkar şəxs onu ziyarət etsə, hökmən günahları bağışlanar”.

Həzrəti-Əli (ə) buyurmuşdur: “Çox çəkməz ki, Xorasan torpağında mənim övladlarımdan biri zəhərləndirilib zülmlə qətlə yetirilər. Adı mənim adımla eynidir. Atasının adı İmran oğlu Musanın adı ilə eynidir. Agah olun ki, hər kəs onu olduğu qürbət ölkədə ziyarət etsə, Allah onun keçmiş və gələcəkdəki günahlarını bağışlayar, əgər günahı ulduzların, yağış damcılarının, yarpaqların sayı qədər olsa da!”

İmam Cəfəri-Sadiq (ə) buyurmuşdur. “Mənim nəvəm Xorasan torpağında bir şəhərdə qətlə yetiriləcək. O şəhərə Tus deyilir. Hər kəs onun haqqına arif olan halda onu ziyarət etsə, Qiyamət günü öz əlimlə onu cənnətə daxil edəcəyəm, hətta kəbirə günah əhli olsa belə!” Soruşdular ki, onun haqqını necə tanımaq olar? Ağa belə cavab verdi: “Belə ki, ona itaət etməyin vacibliyini, onun qərib və şəhid olduğunu yəqin etsin. Hər kəs onu haqqına agah olaraq ziyarət etsə, Allah ona Rəsulullahın önündə şəhadətə çatan yetmiş şəhidin savabını verər”.

Təsadüfi deyildir ki, İmam Rza (ə) ilə bağlı ziyarətnamələrin birində olduqca parlaq ifadələr vardır. Məs: “Salam olsun sənə, Ey Allahın bəndələrə Höccəti! Salam olsun sənə, Ey Allahın Nuru! Salam olsun sənə, Ey Allahın Evinin xəzinəsi! Salam olsun sənə, Ey Allah Hikmətinin mədəni! Salam olsun sənə, Ey Allah Kitabının hamisi! Salam olsun sənə, Ey Allah sirrini qoruyan.

XX əsr aşıq ədəbiyyatının görkəmli nümayəndələrindən olan Dədə Şəmşir Dədə Ələsgərdən sonra bu ada layiq görülmüş aşıqdır. 1980-ci ilə qədər yaşayan kəlbəcərli aşıq 1955-ci ildə Səməd Vurğunla öz kəndlərində görüşərkən onunla Bakıya gəlmək barədə razılığa gəlir. Nə yaxşı ki, söz-sənət mühafizi Səməd Vurğun ona görə Kəlbəcərə gedir. Bu gəliş aşıq ədəbiyyatının yığılıb araya-ərsəyə gəlməsindən başqa, həm də Miskin Abdaldan üzü bəri Şəmşir şəcərəsinin yığılıb toplanmasına səbəb olur. Əgər bu əlyazmalar o zaman yığılıb şeirə, sənətə qiymət verən insanlar tərəfindən qorunub saxlanmasaydı, indi bu sənət inciləri əlimizdə olmayacaqdı. Çünki, Aşıq Şəmşirin və onun oğlunun qəbirləri kimi bir çox yazıları da Kəlbəcərdə düşmən əlində qalıb məhv olacaqdı.

Onun sənətini Ulu Öndər H.Əliyev də çox qiymətləndirərək, Səməd Vurğunla Aşıq Şəmşiri Azərbaycan incəsənət bulağının qoşa gözləri adlandırmışdı.

Baxmayaraq ki, Aşıq Şəmşir tam olaraq sovet dövründə yazıb-yaratmışdır, onun yaradıcılığının böyük bir hissəsini mənsub olduğu kökün, dinin təlimi və İslam mücahidlərinin ruhuna ithaflar təşkil edir. Bu baxımdan bir sıra qoşmaları olduqca diqqətə və təqdirəlayiqdir. Bu şeirlərində aşıq sələflərinə, aldığı dini-fəlsəfi irsə böyük bir ehtiramla yanaşaraq onları dəfələrlə vurğulayır. Din tariximizin ayrı-ayrı böyük şəxsiyyətlərinə həsr etdiyi şeir parçaları, qoşmaları tam bir sənətkar qələminin məhsuludur. Səməd Vurğun fikri aşiqanə ifadə edə bilmək bacarığına, dini-fəlsəfi düşüncə tərzinə görə Şəmşir yaradıcılığının vurğunu idi.

Aşıq Şəmşir yaradıcılığının ən dəyərli nümunələrindən biri də "Öyüdlər" kitabıdır. Həmin kitab 1996-cı ildə Bakıda "Ozan" nəşriyyatı tərəfindən çap olunub. Bu kitabın bir sıra özəllikləri var. Ön söz müəllifi Füzuli Ramazan oğlu Quliyev yazır: "Oxuculara "Öyüdlər" kimi təqdim olunan bu kitabdakı şeirlərin bir qismi vaxtilə aşığın çap olunmuş kitablarından seçilib, bir qismi isə dinlə bağlı olduğundan vaxtilə çapı qadağan edilmiş poeziya nümunələridir, ilk dəfədir işıq üzü görür" (səh. 6). Kitabın araya ərsəyə gəlməsində aşığın oğlu Qənbər Şəmşir oğlu Qurbanovun böyük əməyi var. 296 səhifədən ibarət olan bu kitabın baş redaktoru professor Məhərrəm Qasımlıdır. Burada aşığın qoşmaları, gəraylıları, təcnisləri, dodaqdəyməzləri, müxəmməsləri, divaniləri, bayatıları, cinaslı rübailəri toplanmışdır. Qeyd etmək lazımdır ki, bunların çoxu ilk dəfə çap olunub.

Dədə Şəmşirin 125 illik yubileyi ərəfəsində həmin materialları bir daha nəzərdən keçirdik və aşığın yaradıcılığı ilə bağlı geniş bir məqalə dərc etdirdik ki, oxucular tərəfindən çox rəğbətlə qarşılandı. Həmin məqaləni kitaba daxil etməyi məqsədəuyğun hesab etdik.

Aşıq Şəmşir yaradıcılığı bir çox aspektdən araşdırıldığına görə, biz aşığın yaradıcılığının araşdırılmamış, bu zamana kimi tədqiqatdan kənarda qalmış hissəsini bir qədər qabartmağı lazım bildik. Belə ki, "Öyüdlər" kitabının ön söz müəllifinin də qeyd etdiyi kimi, əsasən onun dini şeirlərini tədqiqata cəlb etdik.

Aşıq Şəmşirin bu istiqamətdə düşüncələri və yazdığı divaniləri tam bir Allah vergisidir. Dinin təbliği, Allah sev-

gisinin tərənnümü, müqəddəslərə məhəbbətin açıq-aşkar bildirilməsi sovet dövründə rəsmən qadağan edilsə də, Aşıq Şəmşir bu hisslərini dərin bir sevgi ilə qələmə almışdır. Aşığın ilahi məhəbbətinin əks olunduğu poeziya nümunələri bu gün daha çox diqqəti cəlb edir. Məsələn, “Mən” rədifli qoşmasında Kərbəla faciəsini xatırladan aşıq İmam Hüseynə və onun oğlu Əli Əkbərə olan sonsuz sevgisini ifadə etmişdir.

*Kərbəla şəhrində məzlum Hüseynin*
*Kəsik peykərinin qurbanıyam mən.*
*O şəhid imamın, o nuri-eynin,*
*Əli Əkbərinin qurbanıyam mən.*

Qoşma formasında qələmə alınmış şeirin digər bir bəndində Aşıq Şəmşirin İmam Rzaya, yenə İmam Hüseynə, Həzrəti-Əliyə və Əbəlfəzl Abbasa olan sevgisini duyuruq:

*Xorasan şahının – Qərib Rizanın,*
*Doqquz min yarası olan ozanın,*
*Zülfüqar sahibi mərd Mürtəzanın,*
*Oğlu Ələmdarın qurbanıyam mən.*

Aşıq Şəmşirin “Gəlmişəm” rədifli qoşması da maraq doğurur. Burada aşığın İmam Rzanın (ə) bacısı Məsumə (s.ə) xanıma müraciətinin şahidi oluruq.

*Deyirlər qızısan Qərib ağanın,*
*Ziyarətə ocağına gəlmişəm.*

*Sınaqlı pirisən qadir Allahın,*
*Eşqə düşüb torpağına gəlmişəm.*

“Neynim” rədifli qoşmasında Aşıq Şəmşir yaşadığı dövrdəki qadağalardan şikayət edir:

*Şəmşir ha səsləyir yazı yazanı,*
*Müdam ruhum cövlan edir havanı.*
*Ziyarət etməyə İmam Rzanı,*
*Yol verilmir gedə qonağa, neynim! (səh. 179)*

Görünür ki, Aşıq Şəmşir dövrünün bəzi qadağanları üzündən dini ziyarətlərdən məhrum qalmışdır. Bəlkə də ən böyük arzusunun həyata keçmədiyinə görə həsrətdə olan aşıq qəlbinin dərinliyində olan inçikliyini obrazlı şəkildə qələmə almışdır. Bütün varlığı ilə Qurani-Məcidin, Peyğəmbərin (s) və pak Əhli-beytin (ə) eşqinə bağlı olan Dədə Şəmşir haqlı olaraq divanini belə bitirir:

*Şəmşirəm, mən halalıma haram maya qatmadım,*
*Bir betərə tələ qurub hiylə, kəmənd atmadım.*
*Bir ziyarət arzuladım, təmənnaya çatmadım,*
*Getdim həsrət, intizarlı, ey çərxi-zamanə, mən.*[52]

Divaninin son bəndində Aşıq Şəmşir halal yaşamağı, haramdan daim uzaq olmağı, həyatda heç kəsə hiylə, kələk qurmamağı, nahaqdan başqalarına böhtan atmamağı tövsi-

[52] Aşıq Şəmşir “Öyüdlər”. Bakı, “Ozan” nəşr. səh. 265

yə edir. Eyni zamanda imam Rzanın (ə) ziyarətini ürəkdən arzu edir, bu ziyarətin intizarı ilə yaşayır və bu ziyarətin ona qismət olmayacağını bilib, bu dünyada çərxi-fələyə şikayət edərək əbədi aləmə qovuşur.

Aşıq Şəmşirin islami dəyərlərə və Qurana münasibəti dəfələrlə müxtəlif qoşma və divanilərində tərənnüm edilib. Aşıq "Bax" rədifli divanisində yazır:

*Pak məhəbbət olan kəsdə, doğru din-iman gərək,*
*Dilində əzbər ola qadiri-Sübhan gərək.*
*Şəmşir, hər an tilavətin ayeyi-Quran gərək,*
*Kirdigarı yadına sal, zikr elə, Qurana bax.*

Aşıq Şəmşirin dini dünyagörüşünü, İslam dininə və Qurana münasibətini öyrənmək baxımından diqqətəlayiq şeirlərdən biri də "Eşqinə" rədifli divanisidir. Bu divanisində dinə bağlılığı daha aşkar bir şəkildə qələmə alınıb. Görünür ki, yaşa dolduqca və Allahın ona əta etdiyi bir verginin böyüklüyünü gördükcə, Aşıq Şəmşirdə daha kəskin bir inam bərqərar olmuşdur. Aşıq Şəmşirin İslam dayaqlarına məhəbbəti bu divanisində tam dərinliyi və fəlsəfəsi ilə diqqəti cəlb edir:

*Altı ismin aşığıyam, bir kirdigarın eşqinə,*
*"La fəta"dan dərs almışam, ismi-barın eşqinə.*
*Mən bəratı, halal təbi Murtəzadan almışam,*
*Yerə, göyə qərar qoyan sənətkarın eşqinə.*

*Əli ibn Əbu Talib mənim ustadım olub,*
*Şəmşirəm, dar günümdə kömək-imdadım olub.*
*Əfsus, bilik sahibiyəm, azca savadım olub,*
*Yetişmişəm təmənnaya, Şahsuvarın eşqinə.*

Özünün də dediyi kimi Aşıq Şəmşirin istedadı bir Allah vergisi idi. Onun nə dini, nə də dünyəvi təhsili o qədər çox deyildi. Buna baxmayaraq, istedad və qabiliyyəti göz qamaşdırırdı. Ağzını açan kimi aşıb-daşan coşqun təbi insanı ovsunlayırdı.

Təəssüf ki, sağlığında ürək dolusu sevdiyi kimsənələrin eşqini bol-bol, sevə-sevə yaşamadı Aşıq Şəmşir. O qoşma və gəraylılar, divanilər işıq üzü görmədi. Digər tərəfdən sevinirik ki, həmin incilər itib-batmadı. Aşığın oğlu Qəmbər müəllimin sayəsində biz bu xəzinədən məhrum olmadıq. Nəhayət, aşığın dini şeirləri də işıq üzü gördü. Bu mənada Aşıq Şəmşiri hər iki dövrün bəxti gətirmiş sənətkarlarından hesab etmək olar.

# VI FƏSİL
# İMAM RZANIN (Ə) ŞƏNİNDƏ OLAN ŞEİRLƏR

## Azad şair Dəbəl

İmam Rzanın (ə) dövründə yaşamış Əhli-beyt (ə) şairi Dəbəl deyir: "Əli (ə) xanədanı haqqında məşhur qəsidəmi Həzrətə (ə) oxumaq üçün Xorasana getmək qərarına gəlmişdim. Nəhayət, Xorasana gəldim və İmamın (ə) huzurunda qəsidəmi oxudum. Həzrəti-Rza (ə) da Tusda şəhid olması ilə əlaqədar bir neçə beyti mənim şeirimə əlavə etdikdən sonra belə buyurdu: "Şeirini gizlət və daha heç kəsə oxuma".

Məmun mənim oraya gəlməyimdən və İmama (ə) qəsidə oxumağımdan xəbərdar olmuşdu. Məni çağırtdırıb qəsidəni ona da oxumağımı istədi. Mən belə bir qəsidəni oxuduğumu inkar etdim, amma Məmun, İmamı (ə) da məclisə çağırtdırıb dedi: "İmamın hüzurunda Əli (ə) xanədanının dəyəri haqqında oxuduğun məşhur qəsidəni mənim hüzurumda da oxu". Mən də məcbur qalıb oxudum. Məmun zahirdə sevinərək məni mükafatlandırdı, onun vəziri Fəzl də mənə yorğa bir at hədiyyə etdi. Həzrəti-Rza (ə) da Məmunun o Həzrətin (ə) adına kəsdirdiyi sikkələrdən yüz dinar mənə verib "bunu saxla, bir gün karına gələr" deyə buyurdu. Mən İmama (ə) belə dedim: "Sizdən

geymiş olduğunuz bir köynək istəyirəm ki, öləndən sonra kəfənim olsun". Həzrət (ə) qəbul edib köynəklərindən birini mənə verərək buyurdu: "Bu köynək səninlə olduğu müddətdə təhlükələrdən qorunacaqsan". Mən Həzrətlə xudafizləşib Fəzlin verdiyi atla karvana qoşulub Tusdan çıxdım. Yolda oğrular karvanımıza həmlə edib var-yoxumuzu apardılar. Çox keçməmişdi ki, mənim atıma minən oğrubaşçısını gördüm. Atın üstündə mənim şeirimi oxuyurdu. Ona yaxınlaşıb "Bu şeiri yazan şairin kim olduğunu bilirsənmi?" deyə soruşdum. Dedi: "Bəli, Dəbəl Xuzaidir". Dedim: "Mənim şair Dəbəl olduğumu bilirsənmi?" O, təəccüblənib sözümə inanmadı. Dedim: "Karvandakılardan soruş". Mənim Dəbəl olduğumu soruşub öyrəndikdən sonra karvandan oğurlayıb öz aralarında paylaşdıqları malları, mənim hörmətimə yiyələrinə qaytardı və İmamın (ə) buyurduğu kimi bu köynək mənim və dostlarımın azad buraxılmasına, əldən getmiş malların qaytarılmasına səbəb oldu".

Dəbəl bu hadisədən sonra Qum şəhərinə gəldi. Camaat onu sevinclə qarşılayıb İmamın (ə) hüzurunda oxuduğu şeiri onlar üçün də oxumasını istədilər. Dəbəl qəbul edib Qum məscidinə getdi və şeirini onlar üçün də oxudu. Camaat ona çoxlu pul və hədiyyələr verdilər və həzrətin köynəyinin əhvalatını öyrəndikdən sonra ona yalvarıb köynəyin müqabilində istədiyi pulu alıb köynəyi onlara verməsini istədilər. Dəbəl qəbul etmədi. Onlar köynəyin bir tikəsini istədilər. Dəbəl yenə qəbul etmədi.

Dəbəl Qumdan çıxdıqdan sonra cavanlardan ibarət bir qrup yolunu kəsib köynəyi ondan aldılar və Quma qayıtdı-

lar. Dəbəl də Quma qayıdıb köynəyin geri verilməsini xahiş etdi. Lakin qəbul etmədilər. Dəbəl köynəyin bir tikəsinin ona qaytarılmasını xaiş etdikdə, qəbul edib köynəkdən bir hissəni min dirhəmlə birlikdə ona verdilər. Dəbəl vətəninə qayıtdıqdan sonra öz evinə tərəf getdi, lakin gördü ki, oğrular onun evini qarət edib hər şeyini aparıblar. Dəbəl İmam (ə) yüz dinarı ona verəndə "Bunu saxla, bir gün karına gələr" deyə buyurduğunu xatırladı. Pulları bazara aparıb hər dinarını yüz dinara satıb on min dinara sahib oldu. Bu arada çox sevdiyi xanımı da xəstələnmişdi. Həkimlər isə onu sağalda bilməmişdilər.

Dəbəl İmamın (ə) köynəyindən ona yadigar qalan parçanı xanımının gözünə bağladı. Sabahısı gün parçanı açanda artıq xanımının gözləri sağalmışdı. Dəbəl cəsarətlə yazdığı məşhur qəsidə və şeirlərinə görə həm var-dövlət, həm də hörmət sahibi oldu. Ondan sonra bütün şiələr ona ehtiram edərdi və özü də tarixdə cəsarətli və azad bir şair kimi tanındı. Onun dəyərli şeirlərindən bəzi misraların tərcüməsi belədir:

Peyğəmbər övladının yıxılmış evini görüncə ağladım,

Yiyələrinin qovulub münafiqlərin onların yerində oturduğu evlər.

Quran təfsiri söylənib vəhyin nazil olduğu evlər indi cinayətkarların zülmləri ucbatından, Quran səsindən məhrum qalıb.

Evin yiyələri Peyğəmbərin mirası və ümmətin ən yaxşı adamları sayılırdılar, yoxsullara yardım edən kişilər.

Onların sərvətinin zülmkarlar əlində olduğunu, onların

bərəkətli əllərinin boş qaldığını görürəm.

Kufə, Mədinə, Kərbəla və Fəsxdə yatan imamlıq səmasının ulduzlarına, islam yolunda öz canından keçən ulduzlara salam göndərirəm.

Bağdadda bir qəbir vardır, orada pak və mübariz bir can yatıbdır, o qəbir cənnətin otaqlarından biridir.

* * *

Dəbəl deyir: "Bura çatanda Həzrəti-Rza (ə) belə buyurdu: "Mən də sənin qəsidənə bir beyt əlavə edirəm ki, kamil olsun: "Tus şəhərində də bir qəbir vardır, bu qəbir böyük bir müsibətə sahibdir və qiyamətə qədər ürəkləri yandırıb, nalələri yüksəldər"

İmamın özünün şəhid olmağını və Tusda dəfn olunacağını xəbər verməsi o Həzrətin (ə) böyük kəramətlərindən biri sayılır.

***Axund Hacı Soltan Hüseynqulu oğlu***

## İMAM RZANIN (Ə) MÖVLUDU MÜNASİBƏTİLƏ

Muştuluq, ey könül, müjdə, ey ürək,
Qərib İmam Rza cahana gəlib.
Dəvasız dərdlərə etməyə çarə,
Dünyayə sahibi-zəmanə gəlib.

Açılır qəlblərə vurulmuş dügün,
Bir kimsə bəşərdən olmasın üzgün,
Sevinc ilə ölçsən bir gündü bu gün,
Vəsfi nə zənnə, nə gümanə gəlib.

Sevincdən yaşarıb gözü Xudanın,
Fərəhi cuş edir ali-əbanın.
Bülbüllər cəh-cəhlə açıb zəbanın,
Bu dəfə sevincdən fəqanə gəlib.

Məhbəsdən çıxarıb fələk həyatı,
Yaşıl rəng bürüyüb bu kainatı.
Görüb bu aləmi,bu cür büsatı,
Kafərlər də dinə,imanə gəlib.

Dünya bivəfadır, dünya gididir,
Gah zəhər, gah da ki ana südüdür.
Bu gün yaxşılığın təvəllüdüdür,
Allahın hünəri meydana gəlib.

Dinsizə bu günçün verilməz cəza,
Bu günü savabçın yazıbdır qəza.
Qəbul et qonağın, ya İmam Rza,
Soltandı, cənnəti-rizvana gəlib.

### ***Hacı Mail***

Ola cəhanda kimin, fərqi yoxdu, nami Rza,
Ölüncə çakəriyəm xatiri-imami-Rza.

Rizayi- həqqi tapar, qalmaz aciz aləmdə,
Tutarsa gər birisi bunca ehtirami-Rza.

İmam fərq eləməz, ya Əlidü, ya Mehdi,
O cümlədən elədir könlümə məqami-Rza.

Xuda nəsib eləmiş, zair olmuşuq ona biz,
Deyildi adımıza, şükr kim, qulami-Rza.

Həmişə etdik uzaqdan təvafi-kuyini, leyk,
Bu gün sənə yetişib eylərik səlam, Rza!

Qalıbdı tərifə aciz dilim, deyər özünə:
-Kodam aciz olan bəndəvü, kodam Rza!

Edibdü töhfə onu Tanrı xaki-İranə,
Veribdü işlərinə ol səbəb nizami Rza.

Əlində töhfəsi yox Mailin imamə görə,
Ölüncə zikr edəcək daima kəlami-Rza.

* * *

Təvəllüd etmisən dünyaya bu gün,
Qəriblər qəribi imami-Rza!
İmamsız dünyada açılmaz dügün,
Qəriblər qəribi imami-Rza!

Qəriblər bilər ki, nə çəkir qərib,
Günəş qürubunda, qərib müztərib.
Görəsən qürbətdə necə can verib,
Qəriblər qəribi imami-Rza?!

Bizik bu dünyadə gərəksiz insan,
Nə yaxşı qanırıq, nə də ki yaman.
Sizinçün dövr edir, günbədi-dövran,
Qəriblər qəribi imami-Rza!

Xudanın məqsədi Sizsiniz ancaq,
Bizdən nə fayda, olub-olmamaq.
Sizə, fəxr edərdik, əgər qul olsaq,
Qəriblər qəribi imami-Rza!

Kim verib baban tək yetmişki qurban,
Taki, xəlq çıxmasın haqqın yolundan.
Sizsiz bu dünyada nəydi müsəlman,
Qəriblər qəribi imami-Rza?!

Qeyrət misalıydı  Həzrəti-Əbbas,
Dünyada heç zaman tayı tapılmaz.
Ona həşrə kimi tutmalıyıq yas,
Qəriblər qəribi imami-Rza!

Dünyaya çox gəlib hər vaxt gözəllər,
Birdə yaranarmı Əliyyül-Əkbər?
Hülqündən oxlanan, o körpə Əsğər,
Qəriblər qəribi imami-Rza!

Canını cananə fəda edən Siz,
Eşqlə dünyayə  səda edən Siz.
Qarunu qapıda gəda edən Siz,
Qəriblər qəribi imami-Rza!

Sədaqət, dəyanət Sizə yaraşır,
Səxavət, şücaət Sizə yaraşır.
Məhşərdə şəfaət Sizə yaraşır,
Qəriblər qəribi imami-Rza!

Xudanın Sizsiniz fəqət məqsədi,
Dünyayə ziynətsiz, qalan heç nədi.
Sizsiz puç olmayan,  qalan əbədi,
Qəriblər qəribi imami-Rza!

Dinin sütunusuz, həm şahısız Siz,
Layiqi-rəhməti-ilahisiz Siz.
Cümlə müsəlmanın pənahısız Siz,
Qəriblər qəribi imami-Rza!

Nəvəsiz Fatimə, o binti-Rəsul (s),
Məşhərə gəlməsə olarıq məlul.
Onsuz bir əməl də olunmaz qəbul,
Qəriblər qəribi imami-Rza!

Əgər olmasaydıq Əliyə qail,
Demək, olmaz idik tanrıya mail.
Hər əməl etsəydik, olardı zail,
Qəriblər qəribi imami-Rza!

Kim ki, tanımayır əimmə-əthar,
Muhamməd(s) dinindən olubdur kənar.
Sizsiz bu dünyada görünən nə var,
Qəriblər qəribi imami-Rza!

Bilirəm Tanrının əzizi Sizsiz,
Özü görünməzdir, əvəzi Sizsiz.
Dünyada kölgəsiz həm izi Sizsiz,
Qəriblər qəribi imami-Rza!

Çoxdandır həsrəti-didarınam mən,
Qürbət məmləkətdə bimarınam mən.
Görəydim o günü zəvvarınam mən,
Qəriblər qəribi imami-Rza!

Sənin mövluduvu yada salmışam,
Fəqət ürəyimdə etmişəm bayram.
Bu murdar şəhərdə yox özgə əncam,
Qəriblər qəribi imami-Rza!

Əgərçi sağ çıxsam gələn mövluda,
Yəqin əvəz olar gələn il bu da.
Kaş, zəvvar olaydım sənə yuxuda,
Qəriblər qəribi imami-Rza!

Dünyanı bürüyüb küfr, cəhalət,
Sizsiz bu dünyayə yoxdur ədalət.
Şəfaət eyləyim, olaq səlamət,
Qəriblər qəribi imami-Rza!

Olaydı qapının gədası Mail,
Ya ki, bu canıyla fədası Mail,
Tapardı bir rütbə, o asi Mail,
Qəriblər qəribi imami-Rza!

***Hacı Ələmdar Mahir***

## İmam Rzanın (ə) mövludinə

Kuyi-dildardən, ey badi-səba, əs bu gecə,
Başqa mənzillər ilə ülfətini kəs bu gecə.

Yenə min zövq ilə gülzari-imamət bəzənib,
Yenə də ətri-imamətlə vilayət bəzənib.
Həm şəhər, həm qəsəbə, həm də əyalət bəzənib,
Toy libasın geyinib, əhli-ibadət bəzənib.
Qoyub izzətlə bu dünyayə qədəm bir Mövla,
Ondan ötrü sevinib, şadlanır hər kəs bu gecə.

Bu o Mövladu ki, mövludinə aləm sevinir,
Sığınıb rəhmətinə, həzrəti-Adəm sevinir.
Belə mövludi görüb, əhli-cəhənnəm sevinir,
Qəmlilər yox, bu səadətli günə qəm sevinir.
Elə zənn etmə bu şənlik, bu büsat bicadır,
Bəxş olub xilqətə bir zati-müqəddəs bu gecə.

Kim bu Mövlayə könül verdi, vilayət tapdı,
Kim ki, bu yolda qədəm atdı, hidayət tapdı.
Kim ki, bu bəzmə qədəm qoydu, səadət tapdı,
Hansı dil ki, onu vəsf etdi, şərafət tapdı.
Sən də ey dil, dilə gəl ki, belə bir Mövlanın,
Həsr edək hüsnünə bir şeri-müsəddəs bu gecə.

Kimi əldə meyi-nab ilə dolu cam tutar,
Kimi Xəyyamsifət badeyi-gülfam tutar.
Hərə bir guşeyi-meyxanədə aram tutar,
Bu elə gündü mələklər onu bayram tutar.
Susma ey dil, bu imam mədhinə sən də səs ucalt,
Hər tərəfdən ucalır şəninə min səs bu gecə.

Bir tərəfdə rəhi-eşqin dili-divanələri,
Bir tərəfdə ürəfa silkinin əfsanələri.
Cəm ediblər bura aqilləri, fərzanələri,
Şüəra sözlə səpər aləmə dür danələri.
Çox şükür ki, belə xoş gündə durub söz deməyə,
Qəbul etmiş məni də ol şəhi-novrəs bu gecə.

Burda meyxanə ilə saqiyə hacət yoxdur,
Burda peymanə ilə badəyə rəğbət yoxdur.
Elə sərməstlərik, durmağa halət yoxdur,
Bir də səndən mey alıb tutmağa taqət yoxdur.
Bağla meyxanəni, mey istəmirik, ey saqi,
Bizə bir cami-məhəbbət eləyər bəs bu gecə.

O gülün ətrini lütf eylə səpib hər yanə,
Mənəvi zövqü səfa bəxş elə hər insanə.
Bizə onsuz bu fəna dəhr dönüb zindanə,
Son qoyaq bəlkə bu daği-ələmi-hicranə.
Dami-qəmdən bizi azad elə, ey badi-səba,
Eyləmə aləmi eşq əhlinə məhbəs bu gecə.

Bu şahın mərtəbeyi-zatını cahil tanımaz,
Elə dəryadır onun lütfü ki, sahil tanımaz.
Bu günün zövqünü hər naşı adam, bil, tanımaz,
Bu şaha layiq olan sözləri hər dil tanımaz.
Onu vəsf etməyə acizdü böyük şairlər,
Mən onun vəsfinə hardan söz acım bəs bu gecə.

Cəhd elə, hər bir işi eylə Xuda xatirinə,
Əymə baş zalıma, dəymə füqəra xatirinə.
Özünü dərk elə şahi-şühəda xatirinə,
Rəhmətin kanı, qəribəl-qürəba xatirinə.
Əldə şəmşir elə imanını, Mahir, kişi tək,
Nəfsini ağlına qurban eləyib, kəs bu gecə.

***Hacı Yusif Qulammirzə Oğlu.***

## Həzrəti-İmam Rzaya (ə) ithaf

Əl açıb Museyi-Kazım elədi həqqə dua,
İntizar içrə onu saxlamadı çünki Xuda.
Ona vaxtında Əli adlı oğul etdi əta,
Razılıqdan ləqəbin verdi o həzrət də, Rza,
Dil açandan olur Allahə ibadətdə Rza.

Harunun zəhrilə Musa ki vurur ömrü sona,
Növbədə oldu Rza rəhbər imamət qoluna,
Çəkdi ətrafını, cəlb etdi hidayət yoluna,
O günəş nurunu hər yanə səpib, yaydı ziya,
Ləkəsiz ayna olur elmi-şəriətdə Rza.

Mə'muna çatdı xəbər, çox düşünüb cəhd elədi,
Onu tez Mərvə gətirtdirdi, vəliəhd elədi:
- Bu xilafət sizə məxsusdu!- deyib əhd elədi,
Keçdi dövran, üzə çıxdı sözü, peymanı riya,
Çarəsiz zülmə dözüb, qaldı əziyyətdə Rza.

O ləin incidir İmami bu az müddətdə,
Üzdə dosttək görünür, düşmən idi niyyətdə.
Gördü yoxdur ona layiq bir adam hikmətdə,
Həsədindən ona zəhri yedirib etdi xəta,
Dəfn edildi vətənindən ara qürbətdə Rza.

O imam elmilə yüksəltdi Peyəmbər yolunu,
Cə'fəri məzhəbinin banisi Heydər yolunu,
Dini-İslamımızın nurlu müzəffər yolunu,
Ən nəhayət bu din uğrunda canın etdi fəda,
Nur idi, nur kimi də qaldı vilayətdə Rza.

Sağlığında o bir örnəkdi Qur'an əhli üçün,
Elmi söhbətlər edərdi Xorasan əhli üçün,
Səcdəgah oldu sora qəbri iman əhli üçün,
Çox mərizlər gəlib öz dərdlərinə tapdı şəfa,
Qoymaz əlbəttə müsalmanları həsrətdə Rza.

Heç zəman süfrədə tənha yeyə bilməzdi təam,
Mehtərindən, nökərindən o tapardı bir adam,
Fəqirə, sailə əl tutmaq idi fikri müdam,
Gecələr xəlvəti yerlərdə gəzərdi füqəra,
Ad çıxartmışdı səxavətdə, ədalətdə Rza.

Cənnətin gül tumu düşmüşdü gülüstanımıza,
İndi də gülləri zinətdi Xorasanımıza.
O gülab ətrini daim səpir imanımıza,
Damlası gözlərə nur, qəlbə verir zövqü səfa,
Bu səbəbdən də qoyub aləmi heyrətdə Rza.

Yusifa, Tanrını sevmək bizə xilqətdəndir,
Dini, Peyğəmbəri sevdirmək imamətdəndir,
Əhli-beyt eşqi ürəklərdə məhəbbətdəndir,
Yalvar öz Xaliqinə, sən də elə həmdü səna,
Bizə imdad eləsin ruzi-Qiyamətdə Rza.

***Hacı Kamil Sərbəndi***

## İMAM RZANIN (Ə) MƏDHİ

Sən gözüvi açan zaman dəhri-fənaya,ya Rza,
Nuri-cəmalın etdi qərq dəhri ziyayə,ya Rza!

Ey məhi-Mustəfa Rza,
Ey güli-Murtəza Rza,
Dideyi-Xeyrətünnisa,
Munisi-Kibriya Rza.

Səltənəti-imamətə,ey şəhi-həştomin olan,
Ey çatan hökmü hər yana,sərvəri-sərzəmin olan.
Həşrdə,ey şəfaəti şiələrə yəqin olan,
Şiə səninlə xoş gedər ruzi-cəzayə,ya Rza.

Şəmsi-səadətim Ağa,
Nuri-hidayətim Ağa,
Yoxdu ümidim özgəyə,
Səndədi şəfqətim Ağa!

Namü nişanı cəddüvün fəxrdi cümlə aləmə,
Rəbbi-Cəlil sizə görə verdi şərafət Adəmə.
Dərgəhi-Həqqə kim çıxıb çatdı Rəsuli-Əkrəmə?
Külli bəşər qalıbdı mat Ali-Əbayə,ya Rza!

Ey du cahan sərvəri,
Ərş ilə fərş zivəri.
Cəddüvə mən fəda, Ağa,
Dəhrdə yox bərabəri.

Cahü cəlalü şövkətin söykənib hökmi-Qüdrətə,
Kim ki səninlə dost ola, sahib olur kəramətə.
Yox hünərim ki, söz deyim səndə olan fəzilətə,
Fikrü xəyal salıb məni bəhri-bəlayə,ya Rza!

Dərdimə bir dəva elə,
Şəfqətüvi əta elə,
Ey güli-Şahi-Kərbəla,
Zülmətimi səba elə.

Ümmət içində hörmətin saldı Məmunu qorxuya,
Düşdü həsəddən atəşə, getmədi çeşmi uyğuya.
Eylədi dərbədər səni məkr ilə,çatdı arzuya,
Zəhr ilə qurbət ölkədə saldı cəfayə, ya Rza!

Can sənə, ey qərib Ağa!
Ey şəhi-binəsib Ağa!
Çatmadı Mə`sumən sənə,
Həsrət ölən nəcib Ağa!

Ziynət idin bu aləmə hər nə qədər ki, sağ idin,
Zülmət içində ümmətə şəmsü məhü çıraq idin.
Dinü şəriətin müdam hifzinə bir dayaq idin,
Xidmətin aşikar idi hökmi-Xudayə,ya Rza,

Ey şəhi-canfəda Rza!
Varisi-“Hələta” Rza!
Ərşü zəminə iftixar,
Dəhrə salan ziya, Rza!

İndi ki,rehlət etmisən, dari-bəqadı məskənin,
Məşhədi,-Tusu döndərib baği-behiştə mədfənin.
Gündə gəlir hüzuruva dost ilə aşina sənin,
Qəbrüvün üstü bənzəyir kuhi-Minayə,ya Rza!

Qəbrüvə mən fəda,Ağa!
Ey şəhi-bavəfa, Ağa!
Kamili-zarü xəstəyəm,
Dərdimə et dəva, Ağa!

**Seyyid Nurəddin Dərafərin**

## MÖVLUDİ İMAM RZA(Ə)

Gülşəndə bu gün nuri-Xuda olmuş huveyda,
Hər bir gülün üstündə oxur bülbüli-şeyda.

Haq aşiqi gülşəndə gəzir əldə piyalə,
Bir badə içib yetmək üçün vəsli-vüsalə.

Bu badə verən kimdi, adın eyləyim e`lan,
Zamini-qəribandı, özü Şahi-Xorasan.

Zilqəddə ayında göz açıb növgüli-Zəhra,
Ətrindən alıb əmr bütün gülşəni-Taha.

Görcək o gülü fəsli-xəzan hər gülə gəldi,
Min tə`rif ilə bülbülü şeyda dilə gəldi:

Qaşları hilal, surətidir bir gülü-əhmər,
Bəh-bəh, nə gözəl gül yaradıb Xaliqi-Davər.

Bu növgülə həmta gülü-reyhan ola bilməz,
İzzətdə,cəlalətdə, Süleyman ola bilməz.

Məh surətinə cümlə gözələr olur heyran,
Layiqdi ona nökər ola,Yusifi-Kə`nan.

Dürr-sədəfi-silseyi-ali-Əbadır,
Hacət qapısı, həm də qəribəl-qürabadı,

Səhnindən öpən müjdeyi-rizvan aparıbdır,
Çox dərdli gəlib, dərdinə dərman aparıbdır.

Hər dərdin ola, Seyyida, yaz bikəsə namə,
Məhşər günü ta ki, çatasan ali məqamə.

***Məşhədi Aslan Aşiq***

Edib Allah səni biçarələrin yarı Rza,
Gəlir aşiqlərin eşqiylə sənə sarı Rza.

Qapına kimdi gələn, mənsəbin axtarmamısan,
Bu ərəbdir ya əcəm, fərqinə heç varmamısan.
Sənə zəvvar olanı boş geri qaytarmamısan,
Hər gələn mehmanının oldun ümidvarı Rza.

Sən İmami-Rəuf adlandırılıbsan, nə gözəl,
Bu qədər mehriban olmaq sizə məxsusdur əzəl.
Hərəmin sanki açıb dil danışır, gəl, yenə gəl,
Olacaq könlünüzün həmdəmi, qəmxarı Rza.

Ey Qəribəl-qürəba, Şahi-Xorasan Rzacan,
Sənə məxsusi rizayət edib ehsan Yaradan.
Hər kim üz tutsa sənə, hacəti olsa nə zaman,
Olmusan sən o kəsin dərdə mədədkarı Rza.

Sözümün, söhbətimin gün kimi aşkarlığı var,
Xəlq edən Allahımın gör nə qədər varlığı var.
Cəmi dörd şəxsidi Peyğəmbərə oxşarlığı var,
Sən də dörddən biri, Peyğəmbərin oxşarı Rza.

Elm ilə çox ürəfa məclisin heyran elədin,
Bəhsə girmiş neçə elm əhlini peşman elədin.
Hər kəsin öz kitabından dəlil ünvan elədin,
Xatəmül-Ənbiyanın alim ələmdarı Rza.

O Hüseyn dinimizi hifz elədi qanı ilə,
Sən isə elmin ilə qoymadın islam əzilə.
İstədin hər kəs özü haqqı görə, haqqı bilə,
Bu səbəb haqqı bilən bəndədi zəvvarı Rza.

Aslanam, Ali-Əli aşiqiyəm, cəfəriyəm,
Mənə izzətdi bu hər yerdə deyim azəriyəm.
Ağacan lütf elə, rəhmət qapının nokəriyəm,
Ey olan kimsəsizin yarı-vəfadarı Rza.

***<u>Kərbəlayi Rəşad</u>***

Ey vilayət günəşi, Şahi-Xorasan, Ağacan,
Eylə aşiqlərüvün dərdinə dərman, Ağacan.
Arizu eyləmişik, yari-vəfadarin olaq,
Bizidə səslə səri-kuyinə, zəvvarin olaq.
Lütfüni hər iki aləmdə bizə eylə əta,
Qəbul et hacətimi, babəl-həvaicsən, Ağa!
Ya Qəribəl-qürəba,
Ya Muinəz-züəfa.

Qovmi-zalim o zaman məqsədinə yetmək üçün,
Cəm' qilmiş neçə alimləri bəhs etmək üçün.
Elmdə mərtəbə göstərdin o biganələrə,
Elminin nuri hidayətdi çü fərzanələrə.
Elminə,xülqünə tə'zim edib ol dəm üləma,
Hələ bu halə təəccübdə idi əhli-cəfa.
Ya Qəribəl-qürəba,
Ya Muinəz-züəfa.

Izz ilə ta ki, gedən vəqtidə sən Tusə tərəf,
Həm mübarək qədəminlə o şəhər tapdi şərəf.
Yusifi-Misr kimi Şahi–Xorasan oldun,
Xeyli biçarələrin dərdinə dərman oldun.
Səni imdadə çağirmiş züəfa, həm füqəra,
Harda bir dərdi olan varsa, edər böylə nida:
Ya Qəribəl-qürəba,
Ya Muinəz-züəfa.

Sən Xudanin tərəfindən bizə bir ne'mətsən,
Hər iki aləmə sən rahnüma, rəhmətsən.
Sən vilayət günəşi, yari-şəhi-Mərdansan,
Sən məriz şiələrin dərdinə bir dərmansan.
Sənsən aləmlərə eşq ilə saçan şəmsi-züha,
Həmən ol şəmsdi ki,bərq vurur ərzü-səma.
Ya Qəribəl-qürəba,
Ya Muinəz-züəfa.

Etdiyin mö'cüzələr xəlqə nümayan oldu,
Bir nəsara sənin eşqinlə müsəlman oldu.
Sureyi -həmd oxudu, Rəbbini iqrar etdi,
Sən dedin ayeyi-Qurani, o təkrar etdi.
Ona bu ayəni tə'lim qilib şahi-rusul,
Həm Peyəmbər, həmi dövrün İmamin etdi qəbul.
Yumaraq gözlərini etdi bu dünyayə vida,
Xoş onun halinə sənsən ona məhşərdə dəva.
Ya Qəribəl-qürəba,
Ya Muinəz-züəfa.

Ey Rəşad,söylə salam Şahi-Xorasanə tərəf,
Bizi də'vət edə Məşhəddəki ünvanə tərəf.
Eyliyək şövq ilə Mövlani ziyarət bir gün,
Eyləsin bizlərə məhşərdə şəfaət bir gün.
Baxsa rəhmət nəzəriylə belə biçarələrə,
O zaman məlhəm olar qəlbidəki yarələrə.
İltimas eyləyirik səndən, Ağa, eylə dua,
Çarə qıl, biz də tapaq dərdə dəva, qəlbə səfa.
Ya Qəribəl-qürəba,
Ya Muinəz-züəfa.

***Zamiq Səfai***

Könlüm istər yenə də, Şahi-Xorasanı görəm,
O ay üzlü gözəli, xosrovi-xubanı görəm.

Düşdü eşqi yenə də başıma şahənşahın,
O gözəl aşiqi, həm həqqə nigəhbanı görəm.

Nola, ya Rəb, yenə öz lütfün əyan eyləginən,
O qəriblər Ağasın, səbrdə ümmanı görəm.

Tək xəyalımda odur, özgə səfa istəmirəm,
Can verirkən, səri-kuyimdə, o Mövlanı görəm.

Kaş öpəydim hərəmin bir də o sabitqədəmin,
Zəhr ilə parələnən ləbləri-ətşanı görəm.

Ömrümün ümdə olan çağları kuyində keçib,
Necə xoşdur, o şərafət dolu dövranı görəm.

Ey Səfai, mən həqiqət yolunun yolçusuyam,
Şad olar könlüm, əgər bircə o cananı görəm.

* * *

Bu gözəllik dolu ehya, nə təravət gətirir,
Ölən hər qəlb büsatınla səadət gətirir.

Belə bir ülvi məhəbbət, fəqət huravidiki,
Səni tərk eyləyən hər qəlb qəramət gətirir.

Səri-kuyin mənə canan qapısın yadə salır,
Qədəmin öpmək ilə sailə izzət gətirir.

Əcəba, ismin olan yerdə nə qəm aşiqinə,
Ucalır mərtəbəsi, eyni-şərafət gətirir.

Səni vəsf etmək üçün yoxdu ləyaqətli sözüm,
Leyk əş'arimə ismindi ki, ziynət gətirir.

Odlu qəlbimdən uzaq tutma, təbibim, rəhmin,
Ali dərgahına bimarını şəfqət gətirir.

Qəribim, könlünü şad eylə qərib zəvvarın
Ki, Səfaini bura hər dəfə dəvət gətirir.

**Emin Həvayi**

Mənim yarım gözəllərdən gözəldir,
Yüzi, əndami hüsni-“ləmyəzəl”dir.
Nə müşküllər açır, müşkülgüşadır,
Necə həll olmayan işlər düzəldir.
Olur eşqiylə aşiq “layəzali”,
Özi çünki əbəddir, həm əzəldir.
Onun eşqi könüldə yoxsa, bil ki,
Bu dinə rəxnə, imanə xələldir.
Cəhanə gəlcəgin güllər açıldı,
Gedib, dünya bağı onsuz xəzəldir.

O eşqin kə'bəsi, həq qibləgahi,
Üzüm döndərmə ondan heç, ilahi.
Mənim yarım xoş iyli bir çiçəkdir,
Duyub ətrini məst olmaq gərəkdir.
Onun şənində gəlmiş hər gözəllik,
Cəhanə zivər, islamə dirəkdir.
Gecə-gündüz dönən başinə şəksiz,
Yerü göy, mahü xurşidü fələkdir.
Qədəm qoydu, cəhani etdi cənnət,
Gedib, qəbri bu dünyayə bəzəkdir.
Həmi hüsnü, həmi ismətdə vahid,
Düşünmə huridir, ya bu mələkdir.
Nisari olsun anin bu tənü can,
Fədasi sinədə çarpan ürəkdir.

O eşqin kə'bəsi, həq qibləgahi
Üzüm döndərmə ondan heç, ilahi

Mənim yarım əcaib bir şəkildir,
Ki, hüsnünə tay bir kəs degildir.
Onu dərk etməyə aciz bu əqlim,
Onu mədh etməyə aciz bu dildir.
Mənim yarım məsihatək öpüşlə,
Ölümcül aşiqi-zarin dirildir.
Ğərib ikən şəhid oldu, tutarlar,
Buna aşiqləri matəm min ildir.
Gülü lalə üzündən şərmgindir,
Günü ay nuri-pakindən xəcildir.

O eşqin kə'bəsi, həq qibləgahi,
Üzüm döndərmə ondan heç, ilahi.

Mənim yarim gözəl bir nazənindir,
Qədəmgahi onun xüldi-bərindir.
Səhiqəddu səmənbuyü miyanmuy,
Pəri peykər, günəş yüz, Məhcəbindir.
Onu adi bəşər zənn eyliyən kəs,
Həqiqətdən nəsibi yox, yəqindir.
Onun nuruyla xəlq oldu nə ki var,
Əsası-həstiyü bünyadi dindir.
Nə xoşdur, səndən olsun razı, çünki,
O ki derlər rizayi-həq həmindir.
Ola şükr, ey Həvayi kim, əzəldən
Mənim yarim imami-həştomindir.

O eşqin kə'bəsi, həq qibləgahi,
Üzüm döndərmə ondan heç, ilahi.

***Adil Əkbərov***

Qəriblərin pənahıdır ziyarətin, İmam Rza,
Əsər qoyur könüllərə məhəbbətin, İmam Rza.

Kimin ki, dərdi var, Ağa, dəvanı səndə axtarır,
Məriz olanlar üz tutub, şəfanı səndə axtarır,
Açıbdı sail əl sənə, səxanı səndə axtarır,
Fəqiri şahə döndərər səxavətin, İmam Rza.

Əsir edib duaları, günahlara məhəbbətim,
Boğur gələn nəfəsləri sinəmdəki xəcalətim,
Hüzuruva gəlim necə, əməldə yox ləyaqətim,
Keç aşiqə, yetər buna kəramətin, İmam Rza.

Xətiblərin xətibisən, təbiblərin təbibisən,
Fəqihlərin fəqihisən, həbiblərin həbibisən,
Ümidimiz qapındı tək, qəriblərin qəribisən,
Vətənsizə vətən verər şəfaətin, İmam Rza.

Cahanda bir nəfər hanı, qapında naümid qalıb?
Kəramət əhlisən Ağa, gələn öz hacətin alıb,
Sənin fəzilətindi bu, ürəkdə bir hərəm salıb,
Kəramətin nişanıdır fəzilətin, İmam Rza.

Sən Adilin əlin tutub, gətir hüzuri-Xaliqə,
Denən, İlahi, rəhm elə bizim günahkar aşiqə,
Fəqət sənin rizayətin nicat verər xəlaiqə,
Odur ki, bərqərar olub İmamətin, İmam Rza.

***Tahir Fikri***

Xudaya, nəsib et, edim ziyarət,
Şahi-Xorasanı, İmam Rzanı.
İzninlə o qərib versin şəfaət,
Kamımdır bir daha görüm Mövlanı.

Xəyalən ziyarət edirəm hər gün,
Ay üzlü gözəli, o Şahənşahı.
Gözlərim həmin an dolur qəhərdən,
Görmək istəyirəm ziyarətgahı.

Bəxş eylə, görüşüm yenə onunla,
İstərdim bir daha görəm hərəmin.
Bölüm dərdlərimi İmamım ilə,
Kaş olaydı qismət öpmək qədəmin,

Eşqindən yanıram, intizardayam,
Təmənnam var Səndən, Xaliqi-Sübhan.
Ağamla görüşmək arzusundayam,
Bir daha, köçmədən, Xaliqi-Sübhan.

Məşhədin dəyəri ondadır, Allah,
Müqəddəs məkandır, Ali ocaqdır.
Ağamdır zinəti oranın, vallah,
Fikrinin hər sətri büsbütün haqdir.

***<u>Aşiq Qurbani</u>***

## ÇƏKİBDİ

Xorasanda qızıl künbəz ağası!
Gözüm sənin intizarın çəkibdi.
Haqq buyurdu, həbib getdi Me’raca,
Ona peşkəş ol Qur’anı çəkibdi.

Haqq buyurdu Şiri-ə’zəm Heydərə,
Şəhadət barmağın saldı Xeybərə.
Şəmameynən getdi ol Şəhrizərə,
Ağam orda boran-qarı çıkibdi.

Xoş o kimsəyə ki, yata yuxuda
Cəbrayıl üstünə gətirə nida.
Ağam Şahi-Mərdan özü davada
Kəfər üstə zülfüqarı çəkibdi.

Yoxdu bu dünyada belə namidar,
Qurbaninin canı yolunda nisar.
Ağam Şahi-Mərdan Düldülə süvar,
Səməndinə qəm çidarı çəkibdi.

***Məzahir Daşqın***

## ŞİKAYƏTİM VAR

Zəmanə qəhrinnən, çərxi fələkdən,
Məni Yaradana şikayətim var.
Zalım fələk bil ki, sənin əlindən,
O Şəhi-Mərdanə şikayətim var.

Qızıl gül tək yeddi qönçə yetirən,
Aparıban Kərbəlada bitirən.
Ruziyə də xoş günləri gətirən,
Məryəm xatuna şikayətim var.

Aman ya Rəbb, qoyma nahaq atlana,
Çəkə qılıncını, susaya qana.
Haqqın tərəfdarı Sahib-Zamana,
İmam əsirinə şikayətim var.

Hamı şad, xuraman gəzir evində,
Təkcə mənəm, ya Rəbb, bu qəm evində.
Biçarə Daşqının zəlil günündə,
Şahi-Xorasana şikayətim var.

***Kərəm Kürqıraqlı***

## GƏLMİŞƏM

Peyğəmbər nəvəsi ey qərib ağam,
Məzarını ziyarətə gəlmişəm.
Ömrüm boyu həsrətində olduğum
Xorasan tək ayələtə gəlmişəm.

Ağa, sənsiz çox kövrəlib dolmuşam,
Nalə çəkib həsrətində olmuşam.
Az oruc, həm də az namaz qılmışam,
Bir ömürlük xəcalətə gəlmişəm.

Sənsiz ah çəkərdim, şuxam elə bil,
Ya qəlblər sızladan aham elə bil.
Rəbbinə qoşulan ruham elə bil,
Heç bilmirəm nə halətə gəlmişəm.

Kərəm, ömrüm sanki çənə bürünüb,
Bəsirətlə bəlkə ağam görünüb.
Qəbrin üstə üzü üstə sürünüb,
Vücudunu itaətə gəlmişəm.

***Zakir Şəhriyaz***

## DİVANİ

Həqiqəti sən açmasan, xilaskarım kim olar?
Haq yolunu düz göstərən səbəbkarım kim olar?
Ahuya zamin olansan, İlahi feyz mənbəyi,
Səndən kömək diləməsəm, mədədkarım kim olar?

İllah sənə çata bilməz nə səxalı, nə Hatəm,
Haqsızlıq atın oynatdı, bizi üzdü bu sitəm.
Dediyimə arxayınam, söhbətimə dürüstəm,
Səni doğru anlamasam, küllü varım kim olar?

Ədəb-ərkana qoşulub, mən gedirəm qol-qola,
Əməlim məndən inciyər, gecikib qalsam dala.
Şəhriyazam, bir başım var, onu qoydum bu yola,
Çevrənizdən ayrı düşsəm, adətkarım kim olar?

***Səda Pünhan***

## İMAM RZANIN (Ə) MÖVLUDU

Ziyarət edək biz İmam Rızanı,
Yazılan səvabın bilinməz sanı.
Düzdürsə mətləbi, sidqi, imanı,
Naümid qaytarmaz insanı geri,
Odur hər müslimin müqəddəs yeri.

Qərq olub sərvətə, şöhrətə, şana,
Yeddinci qiblədir hər müsalmana.
Böyük bir fəxrdir mülki-İrana,
Neçə yüzillərdən ta üzü bəri,
Odur hər müslimin müqəddəs yeri.

Sənin dərgahına uzanıb əlim,
"İmam Rza"-deyib zikr edər dilim.
Etməz ondan qeyri səyi-təkəllüm,
Dönsə də kürreyi-ərzin məhvəri,
Odur hər müslimin müqəddəs yeri.

Uyuduğun torpaq müqəddəs məkan,
Gecənlə gündüzün daim çıraqban.
Səni pənah bilmiş biçarə Pünhan,
Eşit həsrətində olan kəsləri:
Sənsən hər müslimin müqəddəs yeri.

* * *

Mədhinə acizdir qələm-kağızım,
Şənin şövkətinə nə sözlər yazım?
Xanım Nəcmə, ağam Museyi-Kazım,
Onu pay verdi din tariximizə,
Şükr ki, onu Həq bəxş etdi bizə!

Elə ki, yetişdi o mübarək an,
Müqəddəs bir nura qərq oldu cahan.
O şəhri-Mədinə, o şanlı məkan,
Onun mövluduyla geyindi əlvan.
Bəxtəvərlik gəldi çox talesizə,
Şükr ki, onu Həq bəxş etdi bizə!

Yeddi qiblə vardır hər müsəlmana:
Məkkə və Mədinə, Nəcəf, Kərbəla,
Məqabiri-Qüreyş, Sürrə mən Raa,
Yeddinci qibləysə Məşhəddir bizə,
Şükr ki, onu Həq bəxş etdi bizə!

Kaş ki, üz qoyaydıq türbətinizə,
Həmd söyləyərək qismətimizə.
Deyəydik türbəti qoyaraq gözə:
- Nə ali xoşbəxtlik verilmiş bizə,
Şükr ki, onu Həq bəxş etdi bizə.

Didarına müştaq biçarə Pünhan,
Zəvvarın olmaqçun inlər hər zaman.
Əgər ayrı düşsə bədəndən bu can,
Həşrdə döneydi türbətinizə
Şükr ki, ona Həq bəxş etdi bizə!

## İSTİFADƏ OLUNMUŞ MƏNBƏ VƏ ƏDƏBİYYAT:

1. Qurani-Kərim (ərəbcə).
2. Qurani-Kərim (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov; V.N.Məmmədəliyev). Bakı-2005.
3. Ayətullah Möhsin Qiraəti. "Nur təfsiri"-2015 c.VII-VIII" (tərc. H.Arzu).
4. Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah-üzma Nasir Məkarim Şirazi. Bakı-2017.
5. Seyyid Rəzi "Həzrəti-Əli "Nəhcül-bəlağə" 2 cilddə.
6. Şeyx Səduq İbn Babaveyh. "Uyunu Əxbər ər-Rza (ə)" I-II cild. Bakı-2014.
7. Şeyx Abbas Qumi. "İmam Museyi-Kazımın (ə) həyatı. "Mədyən"-1421 (2000) (tərc. Azad Dərgahoğlu).
8. Şeyx Abbas Qumi. "İmam Rzanın (ə) həyatı". "Mədyən" - 1421(2000) (tərc. Azad Dərgahoğlu).
9. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Azərbaycan dərvişləri və rövzəxanları". Bakı-"Boz Oğuz"-1995.
10. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Allah eşqi. Insan eşqi, söz eşqi". Bakı - "Ozan" - 2003.
11. Seyyid Mehdi Dadvər "On dörd məsumu tanıyaq"-10-cu mə`sum İmam Rza (ə). (tərc. Arslan Fəsihi) İ.İ.R.Qum şəhəri "Ənsariyyan"-1420-1999.
12. Şahlar Şərifov. "İslam tarixi". Bakı - Nurlar -2013.
13. Seyyid Kazım Pərpənci. "Üsuliddin". Bakı-"MBM" - 2008.
14. Şeyx Kuleyni. "Üsuli-kafi". I cild, Bakı-2005.
15. M.Füzuli. "Türkcə divanı" (tərtib edəni Əmin Sədiqi). Tehran-1996.

16. Hacı Ələmdar Mahir. “Külliyat”. Bakı-Adiloğlu-2009.
17. Hacı Yusif Qulammirzə oğlu. “İlahidən gələn sevgi”. Bakı-Adiloğlu-2010.
18. M.T.Qumri Dərbəndi. “Kənzül-məsaib” (Əski əlifbadan çevirən və naşir Rəhimağa İmaməliyev), Bakı-1999.
19. S.Ə.Nəbati. “Əsərləri”. Bakı-1968.
20. H.Mail. “Divan”, Bakı-2006.
21. H.Mail. “Qoşmalar”, Bakı-2006.
22. Kərbəlayi Kamil Sərbəndi “Həqiqət ayinəsi”, Bakı-2014.
23. Qurbani. “Bakı Universiteti nəşriyyatı”, 1990.
24. Aşıq Şəmşir (Kəlbəcərli). “Öyüdlər”, Bakı- “Ozan”-1996.
25. Ayətullah Seyyid Kamal Fəqi İmani. “Bir dəstə gül”. İ.İ.R. (Hicri-qəməri.1423-2002).
26. Əhməd Dehqan. “Qırx Məclis, Min Hədis” (tərc. Ramil Əzimov). “Əsri-rəhayi”-2008 .
27. Həsən Hüseynov. “Həzrəti-Əli (ə) müxtəlif baxışlarda”. Bakı-“Nərgiz”-2011.
28. Həsən Hüseyni. “Sığın Haqq Dərgahına” Məqalələr toplusu-I c, “Nərgiz”-Bakı-2013.
29. Məhəmmədi İştihardi. “Könlü oxşayan sözlər”. 14 məsumdan hədislər (tərc. Fəxrəddin Altan). Qum ş., “Ənsaryan”-2005.
30. Əmani. “Əsərləri”, Bakı-“Yazıçı”. 1983.
31. Vərağa Almasov. “Həzrəti-Əli (ə) aşiqi Fizuli. Bakı-2010.
32. Kərəm Kürqıraqlı. “Bəşərə rəhm elə ey qadir Allah!”. Bakı-2008.
33. D.Abbas. “Mən necə gülüm?”. Bakl-“Elm”-2000.

# MÜNDƏRİCAT

